# Şərhçinin kitaba verdiyi tərif

Bismilləh.Həmd olsun Allaha! Allahın Elçisinin üzərinə salavat və salam olsun!

Müəllif "şübhələrin ifşası" adlanan kitabında buyurur:

Qəbirlərə sitayiş edənlərin bir çox şübhələri vardır. Onlar həmin şübhələri Allahın yoluna dəvət edənlərə gətirir və ölülərə dua etmələrini, mələklərdən və peyğəmbərlərdən yardım diləmələrini və bu kimi işləri həmin şübhələr vasitəsi ilə bəzi insanlara gözəl göstərirlər.Onlar insanlara deyirlər: Bunların Allah yanında ad-sanı vardır.Onların Allah yanında şəfaət hüququ vardır.Onlar Allaha yaxın bəndələrdir və biz onlardan şəfaət və yaxınlıq istəyirik.Biz bilirik ki, onlar özləri müstəqil şəkildə heç bir şey etmirlər, habelə onlar yaratmır və ruzi vermirlər.Lakin biz onların şəfaətini diləyir, onların bizi Allaha yaxınlaşdırmalarını istəyir və öz şəfaəti ilə bizə fayda vermələrini umuruq.Onlar insanlara bu cür şübhələr atırlar.

Müəllif "sübhələrin ifşası" adlı bu risaləni şübhələri izah edib onları puç etmək üçün, həmçinin həmin şübhələrin elm və iman əhlinə keçərsiz olduğunu bəyan etmək üçün yazmışdır.Artıq Peyğəmbər (sallallahu aleyhi və səlləm) onun batilliyini açıqlamış, habelə Quran onun batilliyini qeyd etmişdir.

# Gerçək tövhid

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) "şübhələrin ifşası" adlı risaləsində demişdir:

"Mərhəmətli və Rəhmli Allahın adı ilə.Bil ki, Allah sənə rəhm etsin, tövhid; Uca Allahı ibadətdə təkləşdirməkdir.O (tövhid), Allahın öz qullarına göndərdiyi peyğəmbərlərin dinidir.Onların birincisi Nuh (aleyhi-s-sələm) olmuşdur.Belə ki, onun xalqı Vadd, Suva, Yəğus, Yəuq və Nəsr adlı saleh insanlara qarşı ifrata vardıqları zaman Uca Allah Nuhu onlara göndərmişdir.Onların sonuncusu isə Muhamməd (sallallahu aleyhi və səlləm) olmuşdur.Həmin saleh insanların surətlərini sındıran da məhz o, olmuşdur.Uca Allah onu ibadət edən, həcc edən, sədəqə verən, Allahı çoxlu zikr edən lakin bəzi yaradılanları özləri ilə Allah arasında vasitəçilər tutub: Biz mələklər, İsa, Məryəm və digər saleh insanlar mislində olanlardan bizi Allaha yaxınlaşdırmalarını istəyir və onlardan şəfaət diləyirik,-deyən tayfaya göndərmişdir.Uca Allah Muhammədi (sallallahu aleyhi və səlləm) ataları İbrahimin (aleyhi-s-sələm) dinini onlar üçün təzələmək və həmin yaxınlığın və etiqadın sırf Allahın haqqı olduğunu, habelə ondan hər hansı bir şeyi, nəinki başqaları olsun, üstəlik bu yaxın mələk yaxud göndərilmiş peyğəmbər olsun digərinə yönəltməyin doğru olmadığını xəbər vermək üçün göndərmişdir.Bununla belə, həmin müşriklər yaradan və ruzi verənin Bir və şəriksiz olan

Allah olduğunu və ruzini yalnız Onun verdiyini, yalnız Onun dirildib öldür-düyünü, işləri yalnız Onun icra etdiyini və bütün yeddi göylər və yeddi yerlər və onların içində olanların hamılıqla Onun qulları olduqlarını və Onun buyuruğu və tabeliyi altın-da olduqlarını iqrar edir və buna şahidlik edirdilər.

Peyğəmbərin (salləllahu aleyhi və səlləm) savaşdığı həmin müş-riklərin buna şahidlik etmələrinə dair dəlil istəyirsənsə aşağı-daki ayələri oxu: *"De: Sizə göydən və yerdən kim ruzi verir? Qulaqlara və gözlərə sahib olan kimdir? Ölüdən diri, diridən ölü çıxardan kimdir? Hər işi düzüb qoşan kimdir? Onlar: "Allahdır!" -deyəcəklər. De: "Bəs onda Allahdan qorxmursu-nuz?".* (Yunus:31)

Həmçinin Uca Allah buyurur: *"De: Əgər bilirsinizsə, bu yer və yer üzündə olanlar kimindir? Onlar mütləq: "Allahındır!" -deyə cavab verəcəklər. Sən də de: Bəs elə isə düşünmürsünüz? De: "Yeddi göyün Rəbbi, o əzəmətli ərşin Rəbbi kimdir? Mütləq: "Allahındır!"- deyə cavab verəcəklər. Onda sən də de: Bəs elə isə qorxmursunuz? De: Əgər bilirsinizsə, hər şeyin hökmü əlində olan, himayə edən, amma Özünün himayəyə ehtiyacı olmayan kimdir? Onlar mütləq: "Allahındır!" - deyə cavab verəcəklər. Sən də de: Bəs elə isə nə cür döndərilirsiniz?".* (əl-Muminun:84-89) Habelə digər ayələr."

## Şərh:

Şeyx (rahiməhullah) deyir: Bil ki, yəni ey oxucu, ey müsəlman! Bil ki, tövhid: Allahı ibadətdə təkləşdirməkdir.O (tövhid), İzzət və Cəlal sahibi Allahın dinidir: *"Sizin ilahınız bir olan Allahdır, Ondan başqa ilah yoxdur. O, Mərhəmətlidir, Rəhmlidir."* (əl-Bəqərə:163).Habelə buyurur: *"Rəbbin yalnız Ona ibadət etməyi buyurmuşdur".*(əl-İsra:23) Habelə buyurur: *"Biz yalnız Sənə ibadət edir və yalnız səndən kömək diləyirik".* (əl-Fətiha:5) Habelə buyurur: *"Halbuki onlara əmr edilmişdi ki, Allaha-dini yalnız Ona xas edərək ibadət etsinlər".* (əl-Bəyyinə:5).

Beləliklə də, tövhid: Allahı ibadətdə təkləşdirməkdir.Allahın öz qullarına göndərdiyi peyğəmbərlərin dini budur. Onların birincisi Nuh sonuncusu isə Muhamməd (aleyhimə-s-sələm) olmuşdur.Uca Allah buna dair buyurur: *"Biz hər ümmətə: "Allaha ibadət edin, tağutdan çəkinin! -deyə peyğəmbər göndərmişdik".*(ən-Nəhl:36) Peyğəmbərlərin dini məhz budur. *"Səndən əvvəl elə bir peyğəmbər göndərmədik ki, ona: "Məndən başqa heç bir ilah yoxdur. Buna görə də yalnız Mənə ibadət edin!" - deyə vəhy etməyək."*(əl-Ənbiya:25)

Daha əvəllər Nuh bu yol üzərə olmuş, ondan daha öncə isə Adəm və onun nəsli bu yol üzərə olmuşlar.Ondan sonra gələn peyğəmbərlər həmçinin bu yol üzərə olmuşlar. Nəhayət Nuhun tayfasında şirk baş verdiyi və onlar Vadd, Suva`, Yağus və Nəsr adlı saleh insanları Allaha şərik qoşduqları zaman Uca Allah onlara, həmin surətlərə ibadət etməyi qadağan edən Nuhu (aleyhi-s-sələm) göndərmişdir.Halbuki onlar, həmin saleh insanları özlərinə örnək tutmaq üçün onların surətlərini düzəltmişlər.Onlar saleh insanlar olmuşlar. Nuhun tayfasında olmuş həmin adamlar öldükləri zaman şeytan onların yanına gəlib demişdir: Onlar bu cür olmuş, bu cür olmuş, habelə onlar saleh və xeyirxah insanlar olmuşlar. Gəlin onların ibadətini xatırlamaq və onları örnək tutmaq

məqsədilə onların surətlərini düzəldin və onları öz məclislərində yerləşdirin.Bunu sonradan onları yaxud onlardan sonraki nəsilləri şirkə sürükləmək üçün etdi.Nəhayət insanlar onların surətlərini düzəldib onu onların məclislərində yerləşdirdilər.Uzun zaman keçdikdən sonra insanlar Allahı buraxıb həmin surətlərə ibadət etdilər.Həmçinin Uca Allah Peyğəmbəri (sallallahu aleyhi və səlləm) göndərdiyi zaman o, müşriklərin saleh insanlara ibadət etmələrini pisləmiş və Nuh tayfasında baş verənləri onlara xəbər vermişdir.Uca Allah buna dair ona "Nuh" surəsini nazil etmişdir.Vadd, Suva`, Yəğus, Yauq və Nəsr adlı saleh insanların surətlərini sındıran da məhz o, olmuşdur.Həmin surətlər ərəblərdə mövcud idi. Uca Allah Öz Peyğəmbəri (sallallahu aleyhi və səlləm) üçün Məkkəni fəth etdiyi zaman o, həmin surətləri məhv etmək əmrini çıxarmışdır.

Müşriklər həmin bütlərin və onlara bənzər digər bütlərin yanında ibadət edib Allah yanında onların bərəkətini, şəfaətini və faydasını umurdular. *"Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"- deyirlər."*(Yunus:18) Həmçinin: *"Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik! (deyirlər)."*(əz-Zumər:3) Onlar, zamanımızda olan müşriklərin zənn etdiyi kimi həmin bütlərin yaradan və ruzi verən olduğunu etiqad etmirdilər.Zamanımızda olan müşriklər zənn edirlər ki, onlar həmin bütlərin yaradan və ruzi verən olduğunu etiqad edirdilər.Xeyir, onlar həmin bütlərin yaratmaq və ruzi vermək gücündə olmayan yaradılmış bir məxluq olduğunu etiqad edirdilər.Lakin onlar deyirdilər: *"Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!"* (əz-Zumər:3) *"Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"*.(Yunus:18) Buna rəğmən Uca Allah onları təkfir etmiş, onlara Öz Peyğəmbərini göndərmiş və Peyğəmbər bu şirkdən ötrü onlara qarşı savaşmışdır.

Bütün qeyd edilənlər oxucuya şirkin gerçəyini və onun yaxınlıq və şəfaət amacı ilə salehlər vasitəsi ilə şəfaət istəmək, onlardan Allah yanında yaxınlıq diləmək, onlar üçün qurbanlar kəsmək, onlara nəzr etmək və onlara səcdə etmək olduğunu bəyan edir. *"Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!".*(əz-Zumər:3) *"Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"- deyirlər."*(Yunus:18) Müşriklər: Bunlar yaradır və ruzi verir,-deməmişlər.Uca Allah bunu Öz Kitabında bəyan etmişdir.Uca Allah Peyğəmbərinə demişdir: *"De: Sizə göydən və yerdən kim ruzi verir? Qulaqlara və gözlərə sahib olan kimdir? Ölüdən diri, diridən ölü çıxardan kimdir? Hər işi düzüb qoşan kimdir? Onlar: "Allahdır!"-deyəcəklər".*(Yunus:31) Onlar bunu etiraf edəcəklər.Uca Allah buyurur: *"And olsun ki, əgər onlardan özlərini kimin yaratdığını soruşsan, mütləq: "Allah!" -deyə cavab verəcəklər!"* (əz-Zuxruf: 87) Həmçinin buyurur: *"And olsun ki, əgər sən onlardan göyləri və yeri kimin yaratdığını soruşsan, mütləq: "Allah!"-deyə cavab verəcəklər!".*(əz-Zumər:38) Habelə buyurur: *"De: Əgər bilirsinizsə, bu yer və yer üzündə olanlar kimindir? Onlar mütləq: "Allahındır!" -deyə cavab verəcəklər. Sən də de: Bəs elə isə düşünmürsünüz? De: Yeddi göyün Rəbbi, o əzəmətli ərşin Rəbbi kimdir? Mütləq: "Allahındır!"- deyə cavab verəcəklər. Onda sən də de: "Bəs elə isə qorxmursunuz?" De: Əgər bilirsinizsə, hər şeyin hökmü əlində olan, himayə edən, amma Özünün himayəyə ehtiyacı olmayan kimdir? Onlar mütləq: "Allahındır!" - deyə cavab verəcəklər. Sən də de: "Bəs elə isə nə cür döndərilirsiniz?".* (əl-Muminun:84-89)

Buna dair ayələr çoxdur və həmin ayələrin hamısı bu adamların, Allahın yeri, göyü və hər şeyi yaradan olduğunu etiraf etdiklərinə dəlalət edir.Lakin onlar peyğəmbərlər və salehlərdən şəfaət və yaxınlıq istəməklə, onlara qurbanlar

kəsməklə, nəzr etməklə və bu kimi işlər etməklə kafir olmuşlar.Onlar bu üzdən kafir olmuşlar.Ancaq onlar bilirdilər ki, bütün məxluqatın yaradanı və onlara ruzi verən Uca Allahdır. Onlar bunu iqrar edir və bu işdə qətiyyən şübhə etmirdilər. Onlar şəfaət və məğfirət tələbində və digər şeylərdə bunları vasitəçilər tutub demişlər: Bizim onlara yaxınlaşmağımız yalnız onlardan şəfaət diləmək və bizi Allaha yaxın etmək ümidi ilə edilir.Uca Allah bunun batil olduğunu və böyük şirk, küfr və azğınlıq olduğunu, habelə onların ibadətinin, onlara kəsdikləri qurbanların, nəzr əhdlərinin, onlara etdikləri duaların bütövlüklə böyük şirk olduğunu bəyan etmişdir.

Onlar ibadət etdiklərinin yaradılan və ruziyə möhtac olduqlarını etiqad etsələr belə, ibadəti onlara yönlətmiş, onlardan yardım diləmiş, onlara nəzr etmiş və qurban kəsmişlər.Bu isə şirkdir.Lakin sonra gələnlərə şirk əhlinin durumu və tutub getdikləri yolun öncəki müşriklərin şirki olduğu bəyan ediləcəyi zaman öyüd-nəsihət qəbul edəcəkləri, xatırladılacağı zaman isə ibrət alacaqları umulur.

Həmçinin bunlar öncəki müşriklərdən daha da irəli getmişlər.Çünki bunların şirki firavan və çətin vaxtlarda daimi olur.Öncəki müşriklər xüsusi olaraq firavan vaxtı şirk edər, çətin vəziyyətlərdə isə dini xalis Allaha aid edərdilər.Uca Allah bu haqda xəbər verib deyir: *“Gəmiyə mindikləri zaman dini yalnız Ona məxsus edərək Allaha dua edərlər. Allah onları sağ-salamat quruya çıxaran kimi, yenə də (Ona) şərik qoşarlar.”* (əl-Ankəbut:65)

Lakin Bədəviyə, Hüseynə, Ceylənİyə və digərlərinə ibadət edən həmin müşriklər isə daimə, həm firavan vaxtda həm də sıxıntı zamanı Allaha şərik qoşurlar.Allaha pənah aparırıq! Onlar öncəkilərdən daha ağır şirkə və daha böyük və çirkin

günaha sahibdirlər.Onlardan bəzisi hətta rübubiyyətdə Allaha şərik qoşur.Onlardan bir qismi isə öz ibadət etdiyi məbudlarını kainatın idarəçiliyində Allaha şərik edir.Allaha rububiyyətdə şərik qoşmaq başqa növ şirkdir.Bundan Allaha pənah aparırıq!

Bir sözlə, müasirlərin etdiyi şirk öncəki müşriklərin etdiyi şirkdən iki cəhətdən daha böyük və daha çirkindir: Onların etdikləri şirk həm firavan həm də çətin vaxtlarda daimi olur.Öncəki müşriklər isə fərqli olmuşlar.Habelə onlardan bir çoxu öz ibadət etdikləri ilahlarını hətta işləri idarə etmək, məxluqatı yaratmaq, məxluqata ruzi vermək kimi işlərdə Allaha şərik etmişlər.Bu isə öncəki müşriklərin etdikləri şirkdən daha çirkin və azğınlıq baxımından daha təhlükəli və doğru yoldan daha uzaq olmuşdur.Allah qorusun!

## Suallar:

**Sual:** Şeyx Muhamməd bin Abdul-Vahhəbi bu kitabı təlif etməyə nə kimi amillər təşviq etmişdir?

**Cavab:** Qəbirlərə ibadət edən şəxslərin irəli sürdükləri və onunla müsəlmanları azdırmağa çalışdıqları şübhələri izah etmək.

**Sual:** O zaman, Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəbin (rahiməhullah) sağlığında həmin bu işlər əd-Dər`iyyədə mövcud olmuşdurmu?

**Cavab:** Bəli, əd-Dər`iyyə və digər yerlərdə, Misirdə, Şamda, İraqda, hər bir yerdə mövcud olmuşdur.Şübhəsiz ki, bu

şeylər ondan əsrlər öncə mövcud olmuşdur.İlk üç əsrdən sonra insanlar arasında şirk çoxalmışdır.

Sual: Vədd, Suva` və digər salehlər Nuhun zamanında yoxsa ondan öncə yaşamışlar?

Cavab: Onlara Nuhun zamanında ibadət edildi.Özləri isə Nuhdan (aleyhi-s-sələm) öncə yaşamışlar.Həmin surətlər Peyğəmbərin (salləllahu aleyhi və səlləm) zamanına qədər qalmışdır.Onu Kəbənin ətrafından yığışdıran məhz o, olmuşdur.

Sual: Həmin bütlərin dönüb yenidən tək-tək ibadət ediləcəyi haqqında hədis varmı?

Cavab: Xeyir! Səhih hədisdə deyilir: “Yer üzündə “Allah” “Allah” deyilincə qiyamət qopmaz”.[1]Yəni, yer üzünü şirk bürüməyənə qədər.Həmin bütlər və qeyriləri mövcud olarsa və onlardan bir şey qalarsa belə, hər bir halda məna baxımından insanların qəlblərindən iman çıxarıldıqdan sonra ölkələri şirk bürüyəcək. ”Həqiqətən, Allah möminlərin canlarını alan gözəl bir külək göndərəcək.”[2]Nəhayət yer üzündə yalnız kafirlər qalacaq və qiyamət məhz onların üzərinə qopacaq.Allah bizi qorusun!

---

[1]Muslim: Kitəbul iməb.Bəbu zəhəbil imən əzira-z-zəmən:144.Hədisi Ənəs (r.a) rəvayət etmişdir.

[2] Muslim: Kitəbul fitən.Bəbu zikri-d-dəccəl və sıfətihi və mə məahu:2937.Nuvvas bin Səman (r.a) rəvayət etmişdir.

## Öncəki müşriklər rübubiyyəti iqrar etdilər lakin sıxıntı zamanı deyil firavan vaxtlarda üluhiyyətdə Allaha şərik qoşdular

Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Onların bunu iqrar etdiklərinə və həmin şeyin onları Peyğəmbərin (salləllahu aleyhi və səlləm) çağırdığı tövhidə daxil etmədiyinə əmin olacağın zaman biləcəksən ki, onların dandıqları tövhid zamanımızda olan müşriklərin “etiqad” adlandırdıqları ibadət tövhididir.Habelə onlar gecə və gündüz Allaha dua edərdilər.

Habelə onlardan bəzisi, saleh olduqları və Allaha yaxın olduqları səbəbilə onlara şəfaət etmələri üçün mələklərə dua edər yaxud Lat[3] kimi saleh adama və ya İsa kimi peyğəmbərə dua edərdilər.Habelə bilmisən ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) onlara qarşı məhz bu şirkdən ötrü savaşmış və onları ibadəti xalis Allaha aid etməyə çağırmışdır.Uca Allah buyurur: *“Şübhəsiz ki, məscidlər Allaha məxsusdur. Allahdan başqa heç kəsə dua etməyin!”*.(əl-Cinn:18) Habelə buyurur: *“Haqq çağırış yalnız Onadır.Müşriklərin Ondan başqa çağırdıqları*

---

[3] İbn Abbas bunu qeyd edib demişdir: Lat həccə gələnlər üçün buğda yaxud arpanı üyüdüb sıyıq düzəldən şəxs olmuşdur. Buxari: Kitəbu-t-təfsir.Uca Allahın növbəti sözləri: *“Siz tapındığınız Lat və Uzzanı gördünüzmü?”*.(ən-Nəcm:19)

*isə, onlara heç bir şeylə cavab vermirlər."* (ər-Ra`d:14). Həmçinin məhz duanın bütövlüklə Allaha olması, nəzrin bütövlüklə Allaha olması, qurbanın bütövlüklə Allaha olması, yardım diləməyin bütövlüklə Allaha olması və hər bir növ ibadətin bütövlüklə Allaha olması üçün Peyğəmbərin (salləllahu aleyhi və səlləm) onlara qarşı savaşdığına əmin olmusan.Həmçinin bilmisən ki, onların rübubiyyət tövhidini iqrar etmələri onları İslama daxil etməmiş və məhz onların mələklərdən yaxud peyğəmbərlərdən yaxud övliyalardan Allah qatında şəfaət və yaxınlıq istəyərək onlara üz tutamaları həmin adamların qanları və mallarınının toxunulmazlığını aparmışdır.Bu zaman peyğəmbərlərin çağırdığı və müşriklərin onu iqrar etməkdən boyun qaçırdıqları tövhid sənə bəlli olacaq. Bu tövhid, dilə gətirdiyin həmin sözün mənasıdır: "Lə iləhə illəllah"; Allahdan baqşa ibadətə haqqı olan ilah yoxdur.Belə ki, istər mələk olsun yaxud peyğəmbər yaxud övliya yaxud ağac yaxud qəbir yaxud cin, onlara görə ilah sözü bu işlərdən ötrü qəsd edilənə deyilir.Onlar ilah dedikdə, onun yaradan, ruzi verən və işləri idarə edən olduğunu qəsd etməmişlər. Sənə qeyd etdiyim kimi onlar bunun Allaha məxsus olduğunu bilirdilər.Onlar ilah sözü ilə yalnız zamanımızda olan müşriklərin "seyyid:ağa" deyə qəsd etdikləri sözü qəsd etmişlər.Peyğəmbər (salləllahu aleyhi və səlləm) onlara gəlib onları tövhid kəlməsi olan "Lə iləhə illəllah" sözünə çağırmışdır.Bu kəlmədə məqsəd adicə onun tələffüzü deyil həmçinin mənasıdır.Cahil kafirlər, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bu kəlməni dedikdə Uca Allaha üz tutaraq, Ondan başqa ibadət olunanlara küfr edərək və ondan uzaq duraraq Allahı təkləş-

dirməyi qəsd etdiyini bilmişlər.Bu üzdən Peyğəmbər (salləllahu aleyhi və sələm) onlara: "Lə iləhə illəllah" kəlməsini deyin,- dediyi zaman onlar belə cavab verdilər: *"Əcəba, o, ilahların hamısını bir ilahmı edir? Bu, doğrudan da, çox təəccüblü bir şeydir."*(Sad:5) Cahil kafirlərin bunu bilmələri sənə bəlli olacağı zaman İslam iddiasında olan bəzi insanların bu kəlmənin izahına dair cahil kafirlərin anladığı mənanı anlamaması çox təəccüblü səslənəcək.Üstəlik beləlləri onun, hər hansı bir mənasına dair qəlb etiqadı olmadan sadəcə hərflərin tələffüzü olduğunu düşünürlər.Onların ən ağıllısı isə düşünür ki həmin kəlmənin mənası: Allahdan baqşa yaradan, ruzi verən və işləri idarə edən yoxdur,-sözləridir.Bir kişi ki, cahil kafirlər "lə iləhə illəllah" kəlməsinin mənasını ondan daha yaxşı bilirlər, şübhəsiz ki, həmin adam xeyirdən məhrumdur."

## Şərh:

Müəllif (rahiməhullah) demişdir: Artıq yuxarıda qeyd etdiyimiz sözlərdən əmin oldun ki, müşriklər Allahın yaradan, ruzi verən, işləri idarə edən, ölüləri dirildən, yağmuru yağdıran və icra etdiyi hər bir şeydə qadir olan səciyyəsini iqrar etmişlər.Lakin onlar üluhiyyət tövhidini, ibadəti xas Allaha aid etməyi inkar etmişlər və Lat kimi salehlərə yaxud İsa kimi peyğəmbərlərə yaxud ağac və daşlar kimi digər şeylərə bərəkət və şəfaət ummaq məqsədilə tapınmağın qəbahətsiz iş olduğunu hesab etmişlər.Onlar bunu Uzza,

Mənat, Lat, habelə İsa, onun anası, mələklər və qeyriləri ilə etmişlər.Həmin adamlar bunlara tapınmağın yaxud bunlardan şəfaət istəməyin, yardım diləməyin, bunlar üçün qurban kəsməyin və nəzr etməyin qəbahətsiz iş olduğunu və bunu qadağan etməyin doğru olmadığını hesab etmişlər.Bu səbəbdən, Peyğəmbər (salləllahu aleyhi və salləm) onlara: "Lə iləhə illəllah" sözünü deyin,-buyurduğu zaman onlar ona bu sözlərdən ötrü irad tutub demişlər: *"Əcəba, o, ilahların hamısını bir ilahmı edir? Bu, doğrudan da, çox təəccüblü bir şeydir."*(Sad:5) Həmçinin demişlər: *"Və: "Biz heç divanə bir şairdən ötrü ilahlarımızı tərk edərikmi?!" -deyirdilər. Xeyr, o, haqla gəldi və peyğəmbərləri təsdiq etdi."*(əs-Saffət:36-37)

Onlar, Allahın onların Rəbbi, yaradanı, ruzi verəni, yağmur yağdıran, günəş və ayı idarə edən olmasına dair onun dediyi sözü inkar etməmişlər.Onlar bunu gözəl bilirdilər. Peyğəmbər (salləllahu aleyhi və salləm) onları Allahın tövhidinə, Allaha ixlaslı olmağa, habelə Allahdan qeyrisinə nəzr etməyi, qurban kəsməyi və etdikləri digər şeyləri tərk etməyə çağırdığı zaman onlar onun dediyini rədd etmişlər.Çünki onlar Allahdan qeyrisinə nəzr etməyin, dua etməyin, mələklərdən yaxud peyğəmbərlərdən şəfaət istəməyin zərər vermədiyini və bunun, onların vasitəsilə Allaha yönəlmək və yaxınlaşmaq olduğunu zənn etmişlər. *"Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"- deyirlər."*(Yunus:18) Həmçinin: *"Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!" (deyirlər)."*(əz-Zumər:3) Biz onların yaradan, ruzi verən və işləri idarə edən olmaları etiqadı ilə onlara üz tutmuruq. Xeyir! Biz bunun Allaha məxsus olduğunu bilirik.Əslində bu

şəxslərin onları Allaha daha yaxın etmələrini istəyilər.Öncəki müşriklərin dedikləri və Peyğəmbərə (sallallahu aleyhi və səlləm) irad tutduqları söz eynilə sonrakilərin dediyi sözdür.

Sonrakilər, peyğəmbərlər və saleh insanlardan olan ölülərə tapınmaq üçün belə deyirlər: Biz onların şəfaətini istəyirik, onların bizə şəfaət etmələrini istəyirik.Onlar ad-san sahibləridir.Bu üzdən onların bizdən ötrü şəfaətçi olmalarını istəyirik.Onlar Allah yanında bizdən ötrü şəfaət etsinlər və Allah yanında bizə fayda versinlər deyə biz onlara ibadət edirik.Bunların dediyi həmin söz eynilə öncəki müşriklərin dediyi sözdür.Lakin öncəki müşriklərin etdiyi şirk bunların etdiyi şikrdən daha yüngül və daha az olmuşdur.Çünki öncəki müşriklər firavan vaxtda Allaha şərik qoşar, çətin vəziyyətlərdə isə ibadəti xalis Allaha aid edərdilər.Sonrakilərin isə saleh şəxslər və qeyriləri ilə etdikləri şirk həm firavan həm də çətin vaxtlarda daimi şəkildə olur.

Mütləq sənin bu məsələni, habelə müşriklərin dininin müsəlmanların dinindən fərqli olduğunu qavramağın gərəkdir.Peyğəmbər (sallallahu aleyhi və səlləm) onları Allahın tövhid dininə çağırmışdır.Uca Allah onu Allahı təkləşdirməyə və Ona itaət etməyə, habelə Allaha şərik qoşmağı və günahları tərk etməyə çağıran göndərmişdir.Onlar isə bu çağırışı müxtəlif əngəllər, ədavət və çəkişmələrlə qarşılamış və Bədr günü, Uhud günü və Əhzab günü bundan ötrü ona qarşı savaşmışlar.Bütün bunları öz batil dinlərini müdafiə etmək üçün etmişlər.Çünki onlar Allahdan qeyrisinə tapınmış və Ona şərik qoşmuşlar.Lakin Uca Allah Öz Peyğəmbərinə

(salləllahu aleyhi və səlləm) dəstək olmuş və Peyğəmbərinə onların üzərində zəfər bəxş etmişdir.Nəhayət Məkkə zorla fəth edilmiş və insanlar Allahın dininə dəstə-dəstə girmişlər.

Dəvətlə bağlı olan bütün amillər bu mənaya dəlalət edir. Həmçinin əgər dəvət olunan şəxs ölülərə yaxud ulduzlara yaxud digər şeylərə tapınırsa məhz belə bir şəxs dəvət olunmağa və öyrədilməyə zərurət duyur.

Lakin insanın rübubiyyətdə Allaha şərik qoşması əlavə bir şirkdir və həmin şəxs öncəki müşriklərdən daha dərin küfrə sahib birisidir.Bir şəxs öz şeyxinin kainatı nəzarətində saxladığını və işləri idarə etdiyini iddia edəcəyi zaman onun şirki Əbu Cəhlin və onun mislində olanların şirkindən daha böyük olacaq.Öncəki müşriklər yaratmaq, ruzi vermək və idarə etmək kimi rübubiyyət cəhətindən tövhidi anlamış lakin Allaha üluhiyyətdə, qorxu, ümid, oruc, namaz, qurban, nəzr və digər işlər kimi ibadətdə şərik qoşmuşlar.

Sonrakilərin saleh şəxslər və digərləri ilə etdiyi şirk isə həm firavan, həm də çətin vaxtlarda daimi olmuşdur.Bununla da, onlar öncəki müşriklərdən şirki daha çox olan və şəri daha böyük olan insanlara çevrilmişlər.Onların laqeydsizliyi, inadkarlığı və nəsihəti qəbul etməmələri, həmçinin firavan və çətin vaxtlarda Allaha şərik qoşmaları buna səbəb olmuşdur.

Mömin bu məsələyə diqqət yetirməli və bilməlidir ki, şirk; ibadəti yaxud onun bir hissəsini Allahdan qeyrisinə yönəltməkdir.Belə olan halda kafirin rübubiyyət tövhidini iqrar etməsi yaxud etməməsi heç bir əhəmiyyət daşımır.Hər

necə olursa olsun insan Allahdan qeyrisinə ibadət etdiyi, Allahdan qeyrisindən yardım dilədiyi, Ondan qeyrisinə dua etdiyi sürəcə kafir olur.Allah bizi qorusun!

## Suallar:

**Sual**: Alim haqqında belə demək olarmı: Allah sizi müsəlmanlar üçün pənahgah, möminlər üçün sığınacaq etmişdir?

**Cavab**: Bu söz məna baxımından səhihdir.Onlar şəriət məhkəmələri vasitəsilə, əmirlik vasitəsilə hüquqların sahiblərinə verilməsi işində insanların pənahgahıdır.İnsanlar hüquqlarını almaq üçün onlara pənah aparırlar.Bu, doğru mənadır.Alimlər əmr sahibləri üçün dua edir və Allahdan onu müvəffəq etməsini, müsəlmanların ehtiyaclarını çatdırmaqda Allahın ona yardımçı olmasını və insanlar ona pənah apardıqları zaman şər`i buyuruqların icrası yönündən hüquqların qaytarılması yonündən, zalımın əngəllənməsi və sayira cəhətlərdən onların tələblərini yerinə yetirməsini diləyirlər.

**Sual**: Uca Allah buyurur: *"Açıq-aydın dəlillər gəldikdən sonra, bir-birindən ayrılan və ixtilaf törədən kəslər kimi olmayın!"* (Ali İmran:105) Bu ayə, yəhudi və nəsranilər haqqındadır.Həmçinin görə bilərik ki, Peyğəmbər gəldiyi zaman yəhudi və nəsranılər kimi elmə sahib olmayan Qureyş həmçinin ixtilafa düşüb ayrıldılar.Eyni üslubda, yəni kitaba sahib olanların inkar etdikləri kimi inkar etdilər?

Cavab: Yəhudi və nəsranilər şərin təməlidir.Onların ixtilafı onlara elm gəldikdən sonra baş vermişdir.Uca Allah bu ümməti onlar kimi etməkdən qadağan edir.Qureyş və onlara bənzər olanlar heç bir elmə sahib olmamışlar.Uca Allah Muhammədin ümmətinə, kitab əhlinin elm gəldikdən sonra ixtilafa düşdüyü kimi ixtilafa düşməsini qadağan etmişdir. Kitab əhlinə Tövrat və İncil gəldiyi zaman ixtilafa düşdülər və onlara nazil olanla kifayətlənmədilər.Qureyşdən olan kafirlərin düşdüyü ixtilafın isə heç bir əsası yoxdur.Onların düşdüyü ixtilaf cahillərin batil ixtilafıdır və bu işdə onların heç bir istinadı yoxdur.Heç bir əsasa dayanmayan ixtilaf yasaq edilirsə cahillik üzərində qurulmuş ixtilaf ilk növbədə yasaq edilir.

Sual: Onlara gələn açıq-aydın dəlillər bunlar üçün gələn açıq-aydın dəlillər deyilmi?

Cavab: Xeyir! Açıq-aydın dəlillər deyil.Onların açıq-aydın dəlilləri yox ancaq cəhalət var idi.Qureyş və onlara bənzərlər açıq-aydın dəlillərə sahib olmamışlar.Onlar yalnız cəhalət içində idilər.

Sual: Yəhudilərə “israillilər” sözünü, həmçinin nəsranilərə “xristianlar” sözünü nisbət etmək, insanların onlara mənfi münasibət göstərməməsi üçün şərait yaratmaq anlamını daşımırmı?

Cavab: Xeyir! Bu, onların arasında olan adi termindir. Onlardan biri məsihi (xristian) adlanır, yəni məsihə ibadət edir.Həmçinin Tövrat və İncilə nisbət olunduqları üçün kitab

əhli adlanırlar.Mühüm olan, möminin nə yəhudilərə nə nəsranilərə nə də ki, cəhmilər və mötəzilələr kimi bidətlə məşqul olan firqələrə nisbət olunmayıb şər və onun əhlindən uzaq durması və Əhli sunnəyə, səhabələrə və onlardan sonra doğru yol üzərə olanlara, saleh sələfə nisbət olunmasıdır.

Sual: Abdus-seyyid adını qoymaq nə dərəcədə doğrudur?

Cavab: Onu tərk etmək daha məsləhətdir.Çünki bu ad başqa cür yozula bilər.Hərçənd ki, əs-Seyyid Allahın adlarından biridir.İnsanın daha aydın adlar "Abdur-Rahmən", "Abdul-Əziz", "Abdus-Səmi`", "Abdul-Həlim" qoyması daha məqsədəuyğundur.Hər halda əs-Seyyid peyğəmbərin dediyi kimi: "əs-Seyyid Uca Allahdır"[4] Allahın adıdır və bu adı qoymaqda heç bir qəbahət yoxdur.

Sual: Usul məsələlərində ixtilaf furu` məsələlərində olan ixtilafdan fərqlidirmi?

Cavab: Şübhəsiz ki, çox fərqlidir.Cəhmiyyə və onlara bənzər tayfaların Əhli sunnə ilə etdiyi ixtilaf mislindədir.

Sual: Abdul-Mövcud adını qoymaq olarmı?

Cavab: Xeyir! əl-Mövcud Allahın adlarından deyil.Bəli, Uca Allah mövcuddur lakin bu, onun adlarından deyil.

Sual verən: Yəni, xəbər növündən?

Cavab: Bəli!

Sual: Nəfsi istəklər insanı nə vaxt dindən çıxarır?

---

[4] Mə`rifətu-s-sahabə, Əbu Nueym əl-Əsbahani:10/404_6313.

Cavab: Böyük şirkə yaxud böyük küfrə sürüklədiyi zaman.

Sual: Huccətul-İslam sözünü alimə aid etmək nə dərəcədə doğrudur?

Cavab: Bu işdə heç bir qəbahət yoxdur.Bu söz, ifadələrdə keçərli olan sözlər növündəndir.Yəni, əgər o, dəlil gətirər və söz açarsa səriştəli və örnək tutulacaq şəxs olar.Dəlil gətirib insanlara istiqamət verəcəyi zaman elmi və fəziləti səbəbilə İslamda hüccət olarcaq.Gerçək hüccət heç şübhəsiz ki, Quran, sünnə və sələfin icmasıdır.Lakin bəzi alimlərin çoxlu elmə sahib olmaları səbəbilə onlara Huccətul-İslam deyilir. Yəni, həmin insan bir hüccət dilə gətirdiyi zaman onun sözü hüccət olaraq qəbul olunur.Çünki həmin şəxs bir çox dəlillərə sahib-dir.

Sual: Bəzi elm əhlinin qeyd etdiyi kimi əgər bir şəxsin fitnəyə düşmək qorxusu yoxdursa ona: Ey şeyx!- demək olar yoxsa olmaz? Bəzən müəyyən insanlara: Filankəs belədir və belədir, tərif məzmunlu sözlər,-deyildiyi zaman onlar fitnəyə düşür-lər.Belə şəxslər fitnəyə düşməyənlə eyni tutula bilərmi?

Cavab: Məgər fitnəyə düşməyən insan var? Məgər kimsə onun fitnəyə düşməyəcəyinə zəmanət verir? Deyirəm: Onun fitnəyə düşməyəcəyinə kim zəmanət verir? Ehtiyatlı olmaq vacibdir.Təkrar deyirəm: Ehtiyatlı olmaq vacibdir.Allah bizə, sizə və başqa insanlara hidayət versin!

Sual: Qəbirlərə sitayiş çox olan ökələrdə, əslin salamat olması etibarı ilə ət yeyilirmi? Məsələn, insan Misir və Pakistan kimi

qəbirlərə sitayiş yayılmış ölkələrə gəldiyi zaman soruşmalıdır yoxsa əslə əsasən bunu etməməlidir?

Cavab: Əgər ət kəsən şəxs müsəlmandırsa və ondan şirk aşkar olmayıbsa, soruşmayacaq.Lakin əgər şirkdə ittiham olunursa, belə halda soruşur və çəkinir.Çünki həmin ölkələrdə qəbirə ibadət yayılmışdır.Lakin həmin insanı tanıyacağı zaman soruşmağa ehtiyac olmayacaq.Onu tanımayacağı zaman isə soruşmaqda heç bir qəbahət yoxdur.

## Möminin şirkə düşməkdən qorxması vacibdir

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Sənə qeyd etdiklərimi qəlbinlə biləcəyin, habelə: *“Şübhə yoxdur ki, Allah Özünə şərik qoşmağı bağışlamaz, amma istədiyi şəxsin bundan kiçik olan günahlarını bağışlayar”.*(ən-Nisə:116),-deyə Allahın, haqqında bəhs etdiyi şirki biləcəyin, habelə Allahın, ilk peyğəmbərdən tutumuş sonuncuya qədər peyğəmbərlər vasitəsi ilə göndərdiyi və heç kəsdən ondan savayı olanı qəbul etməyəcəyi dini və əksər insanların buna dair cəhalət içində olduqlarını biləcəyin zaman bu, sənin üçün iki fayda ortaya gətirəcək:

Birinci: Allahın lütvü və mərhərmətinə sevinc.Uca Allah buyurur: *“De: “Allahın lütvü və mərhəməti ilə -məhz onunla sevinsinlər. Bu onların yığdıqlarından daha xeyirlidir!”* (Yunus:58)

Həmçinin sən böyük qorxu faydasını əldə etmiş olacaq-san.Belə ki, sən, bir insanın bəzən cahil olduğu halda dilin-dən çıxaracağı kəlmə səbəbilə kafir olacağını lakin cahil-liyində üzürlü olmayacağını, habelə bəzən kafirlərin etdiyi kimi həmin kəlmənin onu Uca Allaha yaxınlaşdırdığını düşndüyü halda onu deyəcəyini biləcəksən.Ələxsus Uca Allah sənə, Musanın tayfasının təqva və elm sahibləri olma-larına rəğmən onun yanına gəlib: *“Bizə onların ilahları kimi bir ilah düzəlt!”*(əl-Ə`raf:138) deməlorinə dair xəbər verdiyini

sənin qəlbinə salacağı zaman bu və bu kimi şeylərdən səni qurtaracaq amillərdən ötrü sənin istəyin və qorxun daha da böyüyəcək."

## Şərh:

Müəllif (rahiməhullah) deyir: "Sənə qeyd etdiklərimi qəlbinlə biləcəyin zaman".Yəni, artıq sənə öncəki müşriklərin halına, habelə onların Allahın yaradan, ruzi verən, idarə edən, öldürüb diriltdən olduğunu bildiklərinə lakin heykəllərə, bütlərə, ağaclara, mələklərə və peyğəmbərlərə yalnız onlara şəfaətçi olacağı və Allaha yaxınlaşdıracağı iddası ilə ibadət etdiklərinə dair dediklərimi biləcəyin zaman.Bu adamlar, Allahın yaradan, ruzi verən, öldürüb dirildən və işləri idarə edən olduğunu bilmədən həmin məbudların yaradan yaxud ruzi verən olması etibarı ilə onlara ibadət etməmişlər.Onlar sadəcə mələklərə, peyğəmbərlərə, bütlərə, Lata, Uzzaya və onlara bənzər digərlərinə onların həmin adamlardan ötrü Allah yanında şəfaətçi və onları Allaha yaxınlaşdıran olması etiqadı əsasında ibadət etmişlər. Buna rəğmən Peyğəmbər (səlləllahu aleyhi və səlləm) onlara qarşı savaşıb ibadəti xalis Allaha aid edəcəkləri zamana qədər onların qanları və mallarının toxunulmazlığını aparmışdır.

Habelə Peyğəmbərin (səlləllahu aleyhi və səlləm) məhv etmək üçün savaşdığı və qurban kəsmək, nəzr etmək, yardım diləmək və bənzər şeylər kimi ibadətin Allahdan qeyrisinə yönəldilməsində öz əksini tapan şirki biləcəksən.Ən böyük günah olan şirk də məhz budur.İnsanın ağac yaxud büt yaxud mələk yaxud peyğəmbər yaxud ölü yaxud ulduzlardan yardım dilə-

məsi məhz şirkin özüdür.İnsanın ondan yardım diləməsi yaxud ona nəzr etməsi yaxud ona qurban kəsməsi və bu kimi şeylər etməsi ən böyük günahdır.Uca Allah buna dair buyurur: *"Şübhə yoxdur ki, Allah Özünə şərik qoşmağı bağışlamaz".*(ən-Nisa:48) Habelə Uca Allah buyurur: *"Əgər onlar (Allaha) şərik qoşsaydılar, etdikləri əməllər puça çıxardı."*(əl-Ən`am:88) Habelə buyurur: *"Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: "Əgər (Allaha) şərik qoşsan, bütün əməlin puça çıxacaq və mütləq ziyan çəkənlərdən olacaqsan!".*(əz-Zumər:65)

Habelə Allahın məhz ondan ötrü peyğəmbərlər göndərdiyi və kitablar endirdiyi İslam dinini biləcəksən.O (din), Allahı təkləşdirmək, Onun əmr etdiklərinə boyun əymək və qadağan etdiklərini buraxmaqdır.Uca Allahın barəsində: *"Allah yanında din, əlbəttə, islamdır."*(Ali İmran:19),- dediyi İslam dini məhz budur.

İslam dini Allahı təkləşdirmək, Ona ixlaslı olmaq, Ona şərik qoşmağı tərk etmək, Onun əmr etdiklərinə boyun əyib qadağan etdiklərini tərk etməkdir.İslam dini budur.O, kor-koranə təqlid, islam iddiasından olmaq, habelə düşüncə və etiqada söykənməyən digər bu kimi şeylər deyil.

İslam dini əqidə və əməldir, söz və əməldir.Bilməlisən ki, Allahın dini; Allahı təkləşdirmək, Ona ixlaslı olmaq, Ona və peyğəmbərlərinə iman etmək, habelə Allahın və Peyğəmbərin xəbər verdiyi hər bir şeyə, cənnətə, cəhənnəmə və digər şeylərə iman etməklə bərabər Peyğəmbəri təsdiq edib ona tabe olmaqdır.İslam dini məhz budur.Bununla birgə insan əmrlərə boyun əyib qadağaları tərk etməlidir.Bəli! Cahil-

likləri üzündən ağaclara, daşlara, bütlərə və övliyalara ibadət etdikləri halda özlərinin müsəlman olduqlarını iddia edən əksər insanların barəsində cahil olduqları Allahın dini məhz budur.

Habelə insanın bəzən cahil olduğu halda dilə gətirəcəyi sözlə kafir olacağını, həmçinin bəzən insanın həmin sözün onu Allaha yaxınlaşdırdığını etiqad etdiyi halda onu dilə gətirəcəyini biləcəksən.Belə ki, bəzən insan bu işə dair heç bir bilgiyə sahib olmadığı halda dini söyür və dinə istehza edir və bununla kafir olur.İnsan əhəmiyyət vermədiyi və diqqət yetirmədiyi halda Allahı yaxud Peyğəmbəri söyür yaxud dinə istehza edir yaxud Allahın vacib buyurduğu işi danır yaxud Allahın bəzi haramlarını danır və nəticədə bununla kafir olur.Bunu biləcəyin zaman Allahın sənə iki böyük fayda əta etdiyini biləcəksən:

Birinci fayda: Allahın lütvü və mərhəmətinə sevinc.Yəni; Uca Allah bu elmi və bəsirəti sənə əta etdiyi zaman Allahın lütvü və mərhəmətinə sevinirsən.Allahın səni İslama müvəffəq etməsi Onun lütvüdür.Səni müsəlmanlardan etməsi isə Onun mərhəmətidir.Allahın səni İslam dini ilə tanış etməsi və ona müvəffəq etməsi Onun lütvüdür.Səni İslam əhlindən etməsi isə Allahın mərhəmətidir.Uca Allah buyurur: *“De: “Allahın lütvü və mərhəməti ilə -məhz onunla sevinsinlər. Bu onların yığdıqlarından daha xeyirlidir!”.*(Yunus:58) Allah sənin köksünü genişlətdiyi, səni öyərtdiyi, səni dində bilikli etdiyi, sənə hidayət edib rəhm etdiyi və nəticədə Onun əhlindən olduğun üçün sevinirsən.Həqiqətən də, bu böyük nemətdir.

İkinci fayda: Qorxu.İnsanların başına gələnin sənin başına gəlməyindən, həlaka düşməkdən, büdrəməkdən qorxursan.Uca Allah buyurur: *“Rəbbindən (Onu) görmədən qorxanları isə bağışlanma və böyük bir mükafat gözləyir!”.*(əl-Mulk:12) Habelə Uca Allah buyurur: *“Onlardan qorxmayın! Əgər möminsinizsə, Məndən qorxun!”.*(Ali İmran:175) Uca Allah cənnət əhlini qeyd etdiyi zaman buyurmuşdur: *“Bu, Rəbbindən qorxanlar üçündür!”.*(əl-Beyyinə:8) Habelə buyurur: *“Bu, məqamımdan və təhdidimdən qorxanlar üçündür!”.*(İbrahim:14) Sən, ayağının büdrəyib şirkə düşməyindən, dinindən xaric olmağından və dünyanı axirətdən üstün tutmağından ötrü Allahdan qorxursan.Qorxursan və həzər edirsən, eyni zamanda Allahın lütvü və mərhəməti və sənə müyəssər etdiyi doğru yol üçün sevinirsən.Sən laqeydsizlik və etinasızlıq yaxud dünyanı axirətdən üstün tutmaq yaxud riddənin digər səbəbləri ilə qəlbinin əyriliyə düşməsindən və ayağının büdrəməsindən qorxursan.

Mömin məhz bu cür olmalıdır. Allahın lütvü və mərhəmətinə sevinməli, onu İslam əhlindən etdiyinə görə Ona həmd etməli, doğru-dürüst olub Allah yolunda öz nəfsi ilə mübarizə aparmalı və ayağının büdrəməsi və qəlbinin əyriliyə düşməsindən qorxmalıdır.O, əksər insanların düşdüyü şirkə düşməkdən qorxmalıdır.

Mömin, Allahın peyğəmbərlər və onların ardıcılları haqqında dediyi kimi olmalıdır: *“Onlar xeyirli işlər görməyə tələsər və ümid və qorxu ilə Bizə dua edərdilər. Onlar Bizə müti idilər.”*(əl-Ənbiya:90) Uca Allah öz dostları haqqında buyurur: *“Həqiqətən, Rəbbinin qorxusundan tir-tir əsənlər; Rəbbinin ayələrinə inananlar; Rəbbinə şərik qoşmayanlar; qəlbləri Rəbbinin hüzuruna qayıdacaqlarından qorxuya düşüb verməli*

*olduqlarını verənlər".*(əl-Muminun:57-60) Onlar yaxşı işlər etdiklərinə rəğmən onların qəlbləri qorxu içindədir.İman əhlinin, peyğəmbərlərin və onların ardıcıllarının vəsfi bu cürdür. Onlar itaətləri yerinə yetirib xeyir işlərdə səylə çalışırlar, eyni zamanda Allahdan qorxur, ayağlarının büdrəyəcəyindən və qəlblərinin əyriliyə düşəcəyindən qorxurlar.Onlar qorxur və həzər edir və əsla arxayınlığa düşmürlər.

Mömin Allahın hiyləsindən arxayın olmamalı, əksinə qorxmalı və həzər etməlidir: *"İman gətirdikdən sonra imanlarına zülm qatmayanları əmin-amanlıq gözləyir. Doğru yola yönəlmişlər də onlardır!".*(əl-Ən`am:82) Onlar doğru imana sahib kimsələrdir.Həmçinin Allahdan qorxmaq, Ona ümid bəsləmək, Onu təzim etmək, Ona ixlaslı olmaq və Onun dinində sabit qədəm olmaq imandandır.Bütün bunlar imana daxildir.Bunlar əmin-amanlıq və doğru yol sahibləridir.Onlar sahib olduqları iman, dürüstlük və ixlas, habelə Allahdan qorxmaları, dinin qayğısına qalmaları və şərin ortaya gəlməsinə səbəb olan işlərdən çəkinmələri səbəbilə buna müvəffəq edilmişlər.

Böyük tabiin İbn Əbu Muleykə[5] (rahiməhullah) demişdir: "Mən peyğəmbərin əshabından otuzu ilə qarşılaşdım və onlardan heç biri öz imanının Cəbrayılın və Mikayılın imanı səviyyəsində olduğunu demirdi.Əksinə onların hamısı öz canı üçün nifaqdan qorxurdular."[6] Onların hamısı qorxub həzər

---

[5] İmam, hüccət, hafiz Əbu Bəkr yaxud Əbu Muhamməd Abdullah bin Ubeydullah bin Zuheyr bin Abdullah bin Cudan bin Amr bin Ka`b əl-Quraşi ət-Teymi əl-Məkki.Əlinin (r.a) xilafəti zamanı yaxud daha öncə dünyaya gəlmişdir. Əbu Zər`a və Əbu Hatim onu etibarlı ravilərdən saymışlar.Buxari demişdir: O, hicrətin yüz on yeddinci ilində vəfat etmişdir.(siyəru ə`ləmi-n-nubələ,Zəhəbi:5/549)

[6] Buxari, Kitəbul imən, bəbu xaufil mumin min ən yuhbəta aməluhu va huva lə yəş`uru:47-48-ci rəqəm.ət-Tərixul əbir:2/137."əs-Sunnə:1080",Xalləl.

edirdilər.Onlardan bəziləri demişlər: İbrahimdən sonra bəlanın gəlməyəcəyinə kim arxayın ola bilər.İbrahim Xəlil deyir: *“Ey Rəbbim! Məni və oğullarımı bütlərə tapınmaqdan uzaq elə!”.* (İbrahim:35) İbrahim qorxaraq deyir: *“Ey Rəbbim! Məni və oğullarımı bütlərə tapınmaqdan uzaq elə! Ey Rəbbim! Onlar (bütlər), həqiqətən, çox insanı azdırıblar”.*İbrahim (aleyhi-s-sələm) bir çox insanın düçar olduğu bəlaya düşməkdən qorxurdu.Həmçinin Peyğəmbərimiz (salləllahu aleyhi və səlləm) daimə Rəbbinə yalvarıb Uca Allaha belə dua edərdi: “Allahım! Mənim bütün günahlarımı, kiçiyini və böyüyünü bağışla!”.[7]O, daimə bu duanı edərdi: “Allahım! Mənim günahımı, bilmədiyimi, işimdə etdiyim israfı və məndən daha yaxşı bildiyini mənə bağışla!”.[8] Həmçinin deyərdi: “Ey qəlbləri çevirən Allahım! Mənim qəlbimi dinin üzərində sabit elə!”.[9] Bunu Allahın Peyğəmbəri və Elçisi, nəhayət canlıların ən xeyirlisi demişdir.Habelə (salləllahu aleyhi və səlləm) demişdir: “And olsun Allaha ki, mən sizin içinizdə Allahdan ən çox qorxan və Ona ən çox təqvalı olanam”.[10] Peyğəmbər (salləllahu aleyhi və səlləm) böyük imana və təqvaya sahib olması ilə birgə and içib xəbər verir ki o, insanlar içində Allahdan ən çox qorxandır. “Canım əlində Olana and olsun ki, mən sizin içinizdə Allahdan ən çox qorxan və Ona ən çox təqvalı olanam”.Allah hamını müvəffəq etsin!

## Suallar:

[7] Muslim, Kitəbu-s-saləh, bəbu mə yuqalu fi-r-ruku`i va-s-sucud:483-cü rəqəm. Əbu Hureyra (r.a) rəvayət etmişdir.

[8] Buxari və Muslim Əbu Musə əl-Əşaridən (r.a) rəvayət etmişlər.

[9] Tirmizi, kitəbul qadər, bəbu mə cəə ənnəl qulubə beynə isbaeyi-r-rahmən:2140-cu rəqəm.Hədisi Ənəs bin Malik (r.a) rəvayət etmişdir.

[10] Buxari və Muslim Ənəs bin Malikdən (r.a) rəvayət etmişlər.

Sual: Müəllif demişdir: Bəzən onu cahilliyindən deyir lakin cahilliyi səbəbilə üzürlü olmur.

Cavab: Çünki həmin şəxs müsəlmanların arasında olur və Quran və sunnə onun yanında mövcuddur.Yəni, burada laqeydsizlik mənası var.

Sual: Bunu səhlənkar şəxsə aid etmək olarmı?

Cavab: Bəli! Çünki səhlənkar insan öyrənmək imkanına malik olduğu halda bunu etmir.

Sual: Hər hansı bir şeyxə: Ey mövlamız,- sözünü demək nə dərəcədə doğrudur?

Cavab: Xeyir, bunu demək doğru deyil.Peyğəmbər (salləllahu aleyhi və sələm) demişdir: "Sizdən heç biriniz: Filankəs mövlam,-deməsin.Çünki sizin mövlanız Allahdır."[11] Lakin kölənin bunu deməsində bir qəbahət yoxdur.

Sual: Ey seyidim (ağam),-sözünü dilə gətirməyin hökmü nədir?

Cavab: Seyid (ağa) sözü məqbul sözlərdəndir.Lakin"seyidim" (ağam) sözünü tərk etmək daha yaxşıdır.Seyid sözündə isə bir qəbahət yoxdur.Belə ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: Mənim bu balam seyiddir (ağadır)."[12] Bu sözlə Həsəni (r.a) qəsd edir.Həmçinin Peyğəmbər (salləllahu aleyhi və səlləm) qəbilə başçılarına: Filan oğullarının seyidi, yəni başçısı kimdir? Həmçinin Sa`d bin Muaz (r.a) üçün demişdir:

[11] Muslim, kitəbul əlfəz minəl ədəb, bəbu hukmi itlaq lafzati əl-abdu əl-əmətu əl-məulə əs-seyyid:2249-ci rəqəm. Hədisi Əbu Hureyra (r.a) rəvayət etmişdir.

[12] Buxari, kitəbu-s-sulh, bəbu qauli-n-nəbiyyi lil həsən bin ali "innə-b-ni həzə seyyid:2704-cü rəqəm.Hədisi Əbu Bəkrə (r.a) rəvayət etmişdir.

“Seyidiniz üçün ayağa qalxın!” Bunu bənu Qureyzanın işinə dair hökm vermək üçün gəldiyi zaman demişdir.

Sual: Cahilliyin üzr olması məsələsinə dair fikirayrılığı ixtilaflı məsələlərdən sayılırmı?

Cavab: Bu, böyük məsələdir.Qayda olaraq müsəlmanların arasında yaşayan şəxs üzürlü olmur.Əgər bir şəxsə Quran və sunnə çatarsa artıq həmin şəxs üzürlü deyil.Uca Allah buyurur: *“Bu, insanlar üçün bir bildirişdir”*.(İbrahim:52) Habelə buyurur: *“Bu Quran mənə sizi və ona yetişəcək kimsələri xəbərdarlıq edib qorxutmağım üçün vəhy olundu”*.(əl-Ən`am:19) Əgər bir şəxsə Quran və sunnə çatarsa həmin şəxs üzürlü sayılmaz.Onun cahil olması isə yalnız onun səhlənkarlığı və laqeydsizliyi üzündəndir.

Müdaxilə: Lakin onun ixtilaflı məsələ olduğu söylənə bilərmi?

Cavab: Xeyir! İxtilaflı deyil və istisna olaraq bəzi gizli qalan incə məsələlər göstərilə bilər.Buna bənzər öz yaxınlarına: “məni yandırın” deyən şəxsin əhvalatını göstərmək olar.

Sual: Uca Allah buyurur: “O, Allah dirildəndir, öldürəndir!”. Bir adam “Muhyiddin” (dini dirçəldən) deyə çağırılır.Bu işdə insanın özünü təmizə çıxartması varmı yoxsa bu işdə heç bir qəbahət yoxdur?

Cavab: Onun tərk edilməsi daha məqsədəuyğundur.Ümumiyyətlə ləqəbin tərk edilməsi daha yaxşıdır.Lakin insanlar ən-Nəvəvi kimi bir çox adama ləqəb isnad etmişlər.Nəvəviyə Muhyiddin demişlər.Çünki o, Allahın yoluna çağırmış, insanlara öyüdlər vermişdir.Bu səbəbdən onu Muhyiddin çağırmışlar.

Müdaxilə: İmam ən-Nəvəvi Muhyiddin deyə çağırılmasını bəyənməzdi?

Cavab: Bunu tərk etmək daha yaxşıdır.

Müdaxilə: Mənim adım Muhyiddindir.Adımı dəyişməliyəm-mi?

Cavab: Bəli! Özünə başqa, daha yaxşı bir ad götür, misal üçün Abdullah yaxud Abdur-Rahmən v.s.

Sual: Uca Allah buyurur: *“Şübhə yoxdur ki, Allah Özünə şərik qoşmağı bağışlamaz”*.(ən-Nisə:48) Bura həm böyük həm də kiçik şirk daxildir yoxsa ancaq böyük şirk?

Cavab: Çox güman ki, kiçik şirk həmçinin ora daxildir.Lakin o, yaxşı əməllərin çoxluğu ilə, mizan tərəzisində üstün gəldiyi zaman bağışlanır.Çünki kiçik şirk, böyük günahlar qəbilindən bir günahdır.Lakin bəzən insan ondan tövbə etməyəcəyi və tərəzisi ağır gəlməyəcəyi zaman bağışlanmır və insan bu hal üzərə ölən böyük günah sahibləri kimi ona görə əzaba düçar olur.Ancaq Uca Allahın böyük günahları əfv etməsi istisna deyil.

Müdaxilə: Qayda olaraq onun böyük günahlardan daha böyük olması deyilirmi?

Cavab: Bu, daha üstün görüşdür.Habelə onun şirk adlandırılması buna dəlalət edir.

## Peyğəmbərlərlə onların düşmənləri arasında olan mübarizə

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Bil ki, Uca Allahın bu tövhidlə göndərdiyi hər bir peyğəmbərə düşmənlər etməsi Onun hikmətindən irəli gəlir. Uca Allah buyurur: *“Beləcə, Biz hər peyğəmbər üçün insan və cin şeytanlarından düşmənlər yaratdıq. Onlar biri digərini aldatmaq məqsədilə bir-birinə təmtəraqlı sözlər təlqin edərlər”.* (əl-Ən`am:112)

Bəzən tövhidin düşmənləri çoxlu elmlərə, kitablar və hüccətlərə sahib olurlar.Uca Allah buyurur: *“Peyğəmbərləri onlara açıq-aşkar dəlillər gətirdikdə özlərində olan elmə sevindilər”.*(Ğafir:83)

Bunu, habelə Allaha aparan yolda fəsahət, elm və hüccət sahibi olan düşmənlərin mütləq onu kəsdirəcəyini biləcəyin zaman sənin üzərinə Allahın dinindən həmin şeytanlarla mübarizə aparmağa əlində silaha çevriləcək elm öyrənmək vacib olacaq.Həmin şeytanların imamı və öndəri isə sənin Rəbbinə belə demişdir: *“Sənin düz yolunun üstündə oturub insanlara mane olacağam! Sonra onların yanına qarşılarından və arxalarından, sağlarından və sollarından gələcəyəm və Sən onların əksəriyyətini şükür edən görməyəcəksən!”.*(əl-Ə`raf:16-17)

Lakin sən Uca Allaha üz tutub Onun hüccətlərini və açıq-aydın dəlillərini dinləyəcəyin zaman qorxma və kədərlənmə! *“Şübhəsiz ki, şeytanın hiyləsi zəifdir!”.*(ən-Nisə:76)

Tövhid əhlindən avam birisi bu müşriklərin min alimini üstələyər.Uca Allah buyurur: *“Bizim əsgərlərimiz mütləq zəfər çalacaqlar”.*(əs-Saffət:173) Allahın əsgərləri, qılınc və silahla zəfər çalacaqları kimi həmçinin hüccət və kəlam ilə zəfər çalacaqlar.Qorxu isə yalnız silahsız yola düşən tövhid əhlindən ötrü vardır.Uca Allah bizə öz kitabını bəxş etmiş və onu *“hər şeyi izah edən, müsəlmanlara da bir hidayət, mərhəmət və müjdə”*(ən-Nəhl:89) etmişdir.Batil fikirlər daşıyıcısının gətirə biləcəyi hər bir hüccət, Qurani Kərimdə puça çıxarılır və onun batilliyi bəyan edilir.Uca Allah buyurur: *“Sənin yanına gəlib elə bir misal çəkməzlər ki, Biz sənə doğrusunu və izahatca daha yaxşısını gətirməyək”.*(əl-Furqan:33) Bəzi təfsirçilər demişlər: Bu ayə, qiyamət gününəcən batil əhlinin gətirəcəyi hər bir hüccəti şamil edir.”

---

## Şərh:

Müəllif (rahiməhullah) deyir: Bil ki, Uca Allah bu tövhidlə göndərdiyi hər bir peyğəmbərə düşmənlər etmişdir.Bu, Nuh peyğəmbərin zamanından ta Muhamməd (aleyhimə-s-salətu va-s-sələm) peyğəmbərə qədər imtahan və sınağ olaraq davam etmişdir.Bununla da, xeyirxah insanlar şər əhli ilə, peyğəmbərlər düşmənləri ilə və Allaha çağıranlar onlara düşmən kəsilən şəxslər ilə imtahana çəkilirlər.Bu səbəbdən, bunlarla

mübarizə aparmaq üçün hazırlaşmaq və tədarük görmək labüddür.Uca Allah buyurur: *“Beləcə, Biz hər peyğəmbər üçün insan və cin şeytanlarından düşmənlər yaratdıq. Onlar aldatmaq məqsədilə bir-birinə təmtəraqlı sözlər təlqin edərlər. Əgər Rəbbin istəsəydi, onlar bunu etməzdilər. Onları uydurduqları yalanlarla birlikdə boşla getsinlər! Axirətə inanmayanların ürəkləri onlara meyl etsin, onlar ondan xoşlansınlar və gördükləri çirkin işləri bir daha görsünlər.”*.(əl-Ən`am:112-113)

Həmçinin Uca Allah buyurur: *“Beləcə hər peyğəmbər üçün günahkarlardan bir düşmən etmişdik.Rəbbinin sənə doğru yolu göstərən bir rəhbər, bir mədədkar olması kifayət edər!”*.(əl-Furqan:31)

Peyğəmbərlərin düşmənləri vardır.Onlar müxtəlif şübhələrə və hüccətlərə sahib olub onu peyğəmbərlərə və onların ardıcıllarına gətirirlər.Habelə onların müraciət etdikləri və vasitəsi ilə şübhələr gətirdikləri kitabları vardır.Uca Allah buyurur: *“Peyğəmbərləri onlara açıq-aşkar möcüzələr gətirdikdə özlərində olan elmə sevindilər”*.(Ğafir:83) Yəni, batil və fayda verməyən elmlər.Lakin bu elmlər səbəbilə hidayət dəvətçiləri və peyğəmbərlər müxtəlif şübhələr ilə üzləşirlər. Bununla belə, haqq sahibi açıq-aydın dəlillərə və elmə sahib olacağı zaman həmin şübhələrə əhəmiyət verməyəcək, üstəlik həmin şübhələri puç edib onun batilliyini bəyan edəcək. Çünki həmin şəxs elm üzərədir.Uca Allah buyurur: *“De: Bu mənim yolumdur. Mən və mənə tabe olanlar, mötəbər dəlillərə əsasən, insanları Allaha tərəf çağırırıq.”*(Yusuf:108) Peyğəmbərlər həmin şübhələri puç edib onun batilliyini bəyan etdikləri kimi həmçinin peyğəmbərlərin ardıcılları batil əhlinin

hüccətləri və şübhələrinin batilliyini bəyan edir, onun saxta olduğunu ifşa edir və Allahın onlara verdiyi elm və şər`i dəlillər ilə insanlara haqqı izah edirlər.Uca Allah buyurur: *“Sənin yanına gəlib elə bir misal çəkməzlər ki, Biz sənə doğrusunu və izahatca daha yaxşısını gətirməyək”.*(əl-Furqan:33)

Uca Allah buyurur: *“And olsun ki, peyğəmbər bəndələrimiz haqqında əvvəlcədən bu sözümüz deyilmişdi: Onlar mütləq qalib gələcəklər.Bizim əsgərlərimiz mütləq zəfər çalacaqlar!”.* (əs-Saffət:171-173) Habelə buyurur: *“Allah Ona yardım edənlərə, şübhəsiz ki, yardım edər. Həqiqətən, Allah yenilməz qüvvət sahibi , qüdrət sahibidir! O kəslər ki, əgər onları yer üzündə yerləşdirsək, namaz qılar, zəkat verər, yaxşı işlər görməyi əmr edib, pis işlər görməyi qadağan edərlər.”*(əl-Həcc: 40-41) Habelə buyurur: *“Ey iman gətirənlər! Əgər siz Allaha yardım göstərsəniz, O da sizə yardım göstərər və sizi sabitqədəm edər.”* (Muhamməd:7)

Haqqı bilib elm sahibi olan savadlı şəxs bəsirət üzərədir. Tövhidi və şirki bilən şəxs bəsirət üzərədir.Həmin yaramazların şübhələri onu aldatmır və çaşqınlığa salmır.Əksinə o, bu şübhələri dağıdır, onların batilliyini izah edir və insanlar üçün onu ifşa edir.Artıq eşitdiyin kimi Uca Allah demişdir: *“Sənin yanına gəlib elə bir misal çəkməzlər ki, Biz sənə doğrusunu və izahatca daha yaxşısını gətirməyək”.* (əl-Furqan:33). Batil fikirlər daşıyıcısının gətirə biləcəyi hər bir hüccət, Qurani Kərimdə puça çıxarılır və onun batilliyi bəyan edilir. Onlar Uca Allahın ayəsini gətirib insanları şübhəyə salırlar: *“Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər.”*(Yunus:62) Məgər bu ayədə onlar üçün dəlil var? Bəli, Uca Allahın dediyi kimi: *“Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər”.* Məgər bir kimsə sənə: Allahdan başqa onlara dua et!-deyib? Uca Al-

lah onlardan biri olasan deyə sənə bəyan etmişdir. Onlardan biri olmağın üçün elm öyrən və Allahın itaətində doğru-dürüst ol! Onların Allahın dostları (övliyaları) olmaları, onlara dua etməyi və onlardan yardım diləməyi icazəli etmir. Habelə peyğəmbərlər ən fəzilətli möminlərdir. Onlar Allahın dostlarıdır. Bununla belə, Allahdan başqa onlara ibadət etmək icazəli deyil. Digər möminlər həmçinin Allahın dostları və Allahın saleh qullarıdır. Lakin peyğəmbərlərə ibadət etmək icazəli olmadığı kimi onlara da ibadət etmək icazəli deyil. Sən yalnız Bir olan Allaha ibadət et! Uca Allah buyurur: *"Sən də dini məhz Allaha xas edərək yalnız Ona ibadət et!"*.(əz-Zumər:2) *"Halbuki onlara əmr edilmişdi ki, Allaha -dini yalnız Ona xas edərək, batildən haqqa (islama) dönərək -ibadət etsinlər"*.(əl-Bəyyinə:5)

Məsələ aydındır. İnsan Allaha qarşı səmimi olacağı, elm tələb etməkdə sadiq olacağı, dində biliyi artıracağı, şər`i dəlilləri öyrənəcəyi və Qurani Kərim, həmçinin pak sunnə ilə marağlanacağı zaman Uca Allah ona batil əhlinin hüccətlərini ifşa etməyə, şübhələrini aradan götürməyə və haqqı aşkara çıxarmağa yardımçı olacaq. Qorxu yalnız silahsız yol gedəndən ötrüdür. Elm tələbəsi silahsız olduğu zaman onun üçün qorxu var. Həmin şəxsin elm silahı, dəlillər silahı yoxdur. Bəsirətsiz elm iddiası gerçək elm deyil. Silah olan elm; Allah dedi və Peyğəmbəri dedi,-gerçəyidir. İnsan elmə və mötəbər dəlillərə sahib olacağı və Allaha qarşı səmimi olub Allah ilə sadiq olacağı zaman Allah ona həmin şəxslərin əleyhinə yardımçı olacaq və onu həmin adamların şərindən qoruyacaq. İnsandan ötrü yalnız elmin azlığı yaxud niyyətin fəsada uğraması yaxud ixlasın yoxluğu qorxusu var.

## Suallar:

**Sual:** Bəsirət nədir?

**Cavab:** Bəsirət Allahın və Peyğəmbərin dediyi, həmçinin haqq əhlinin və batil əhlinin üzərində olduqları yola dair olan elmdir.İnsan tövhidlə şirki və İslam ilə ona zidd olanı Allahın ona əta etdiyi bu elm vasitəsi ilə ayırd edə bilir.

**Sual:** Siz qeyd etdiniz ki, onun elmi var lakin bəsirəti azdır. Bu, nə deməkdir?

**Cavab:** Bəsirət azlığı elmin azlığıdır.Həmin şəxsin bir qədər elmi var ancaq kamil surətdə deyil.Bəzi insanlarda müəyyən elm olur lakin onlar tələb olunan elmə diqqət ayırmırlar. İnsanların əksəriyyəti belədir.

**Sual:** Elmi möhkəmlətməyə və məsələləri mükəmməl qavramağa yardımçı olan səbəblər hansılardır?

**Cavab:** Quran və sunnəyə böyük diqqət ayırmaq, habelə insana doğru istiqamət vermələri üçün səbat, elm və bəsirət ilə tanınan sunnə alimlərindən elm almaqla buna nail olmaq olar.

**Sual:** Qorxu nə vaxt böyük şirkdən olur?

Cavab: Böyük şirk gizli qorxudur.Vacibi tərk etməyə yaxud günah işlətməyə sövq edən qorxu isə günah və kiçik şirk adlanır.Belə ki, insanı buna, uşağından yaxud zövcəsindən ötrü qorxu sövq edərsə həmin qorxu şirk olmayacaq.İnsanın öz zövcəsinin qəzəbindən qorxaraq yaxud övladının qaçmasından yaxud spirtli içkilərə qurşanmasından qorxaraq Allahın haram etdiyi bir şeyi etməsi və ya zövcəsini razı salıb onu

qəzəbləndirməkdən qorxaraq yaxud müdirdən qorxaraq camaatla birgə namazı tərk etməsi günah sayılır.

Sual: Qorxu Allaha şərik qoşmağa daxildirmi?

Cavab: Bəli! Bütlərdən və ulduzlardan qorxan şəxs şirk edir. Oğurluqdan qorxub qapını bağlayan şəxsin əməlində isə heç bir qəbahət yoxdur.

Sual: Məsələn insandan qorxanın hökmü nədir?

Cavab: Buna zəmin olacağı zaman.İnsan zalim başçıdan qorxur yaxud yolda quldurla rastlaşacağından qorxub özü ilə silah götürür və şərin səbəblərindən qorunur və uzaq durur. Əgər qorxuya zəmin olarsa heç bir qəbahət olmaz.

Sual: Sələfiliyə mənsub olan bir çox insanlar hüccətin qaldırılması məsələsində bunu edənin alimlərdən olması şərtini irəli sürürlər.Adi insan isə küfr sözə rast gələcəyi zaman ona deyilir: Xeyir! Sən təkfir edə bilməzsən?

Cavab: Hüccətin qaldırılması, dəlilin çatdırılmasıdır.Yəni, bu, hüccətin qaldırılmasıdır.Hər bir şəxs öz halı etibarı ilə hərəkət edir.

Sual: Avam insanın küfr işlədən şəxsi təkfir etmək haqqı varmı?

Cavab: İnsanın küfr etdiyi sabit olacağı zaman təkfir edəcək. Buna mane olan nədir? Bir insanda, onun küfrünü vacib edən amil olacağı zaman onu təkfir edəcək.Belə ki, biz Əbu Cəhli, Əbu Talibi, Utbə bin Rabianı, Şeybə bin Rabianı təkfir edirik.Artıq onların küfr üzərə ölmələrinə və Peyğəmbərin, kafir olduqları halda onlara qarşı Bədr günü savaşdığına dair dəlil mövcuddur.

**Sual:** Bəzi insanlar adi insanlar üçün təkfirin yasaq olduğunu deyirlər.Beləsinin hökmü nədir?

**Cavab:** Avam insan yalnız dəlil əsasında təkfir edə bilər. Avam insanın müəyyən bir şey haqqında elmi olmur.Lakin əgər onun müəyyən bir şey haqqında elmi olarsa fərqli olar. Məsələn əgər insan zinanın haramlığını danarsa, beləsi həm adi insanlar həm də ixtisas əhli qatında təkfir ediləcək. Çünki beləsinin şübhəsi yoxdur və onun dəlillərə ehtiyacı yoxdur. Deyirəm: Beləsi dəlillərə lüzum duymur.Yaxud belə deyir: İnsanların Allahdan başqasına ibadət etmələri icazəlidir. Məgər kiminsə buna dair şübhəsi ola bilər? Beləsinə dəlil gətirməyə ehiyac yoxdur.Əgər biri: İnsanların bütlərə, ulduzlara və cinlərə ibadət etməsi icazəlidir,-deyərsə yaxud: Namaz vacib deyil, istəyən qıla bilər istəyən tərk edə bilər,- deyərsə, kafir olar.Təkfirdə dayanmaq yalnız adi insanlara gizli qalan müəmmalı məsələlərdə olur.

**Sual:** Bəzi insanlar deyirlər: Adi insanlara, Allahın ucalıq sifəti və başqa işlər kimi etiqadı məsələləri aşılamaq gərək deyil.

**Cavab:** Əqidə ən önəmli məsələdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) Məkkədə on üç il insanlara yalnız əqidəni aşılamışdır.Əqidə dinin əsasıdır.

**Sual:** Bunu deyən elm əhlindən sayıla bilərmi?

**Cavab:** Xeyir! Elm əhlindən sayıla bilməz.Beləsi cahillərdən sayıla bilər.

## Tövhid əhlinin müşriklərin şübhələrinə cavabları

Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Mən sənə Uca Allahın Öz kitabında qeyd etdiyi şeyləri zamanımızda olan müşriklərin bizə qarşı dəlil gətirdikləri sözlərə cavab olaraq qeyd edirəm.Belə ki, biz deyirik: Batil əhlinə iki cəhətdən cavab veriləcək: Yığcam və ətraflı cavab. Yığcam cavab, onu dərk edən şəxs üçün əzəmətli iş və böyük faydadır.Belə ki, Uca Allah buyurur: *“Kitabı sənə nazil edən Odur.O kitabın bir qismi mənası aydın olan ayələrdir ki, bunlar da Kitabın anasıdır.Digərləri isə mənası aydın olmayan ayələrdir.Qəlblərində əyrilik olanlar fitnə-fəsad törətmək və istədikləri kimi yozmaq məqsədilə mənası aydın olmayanın ardınca düşürlər.Onun yozumunu isə Allahdan başqa heç kəs bilməz.”*(Ali İmran:7) Habelə səhih hədisdə gəlmişdir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Aydın olmayanın (mütəşabihin) ardınca düşənləri görsəniz, bilin ki, onlar Allahın dediyi şəxslərdir.Onlardan həzər edin!”.[13]Buna misal: Əgər müşriklərdən biri sənə: *“Şübhəsiz ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar kədər içində olmazlar”*,- deyərsə, yaxud şəfaəti dəlil gətirib onun haqq olduğunu və peyğəmbərlərin Allah qatında ad-san sahibləri olduqlarını deyərsə yaxud qeyd edəcəyi sözün mənasını anlamayacağın halda öz batilinə dəlil gətirmək üçün Peyğəmbərin (salləllahu aleyhi və səlləm) sözlərini qeyd edərsə, belə olan halda ona bu cür cavab ver: Uca Allah qəlblərində əyrilik olanların aydın olanı (möhkəmi) tərk edib aydın olmayana (mütaşabihə) uyduqlarını qeyd etmişdir.Sənə xatırladıram ki, Uca Allah,

[13] Buxari və Muslim rəvayət etmişlər.Hədisi Aişə (r.a) rəvayət etmişdir.

müşriklərin rübubiyyəti iqrar etdiklərini və onların yalnız mələklərə, peyğəmbərlərə, övliyalara tapınmaları ilə birgə: *“Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir”*,- dedikləri üçün kafir olduqlarını qeyd etmişdir. Bu isə, heç kəsin mənasını dəyişə bilməyəcəyi möhkəm və açıq-aydın məsələdir.Sənin isə, ey müşrik, Qurandan yaxud Peyğəmbərin (salləllahu aleyhi və səlləm) kəlamından mənə qeyd etdiklərinin mənası mənə bəlli deyil.Lakin mən qəti bilirəm ki, Allahın kəlamında ziddiyət yoxdur.Habelə Peyğəmbərin sözləri Allahın sözlərinə müxalif deyil.Bu, doğru və dürüst cavabdır. Lakin bunu yalnız Allahın müvəffəq etdiyi şəxslər anlayır. Onun şənini kiçiltmə! Uca Allahın dediyi kimi həmin şəxsin vəsfi belədir: *“Bu isə ancaq səbir edəblərə verilir və ancaq böyük qismət sahiblərinə nəsib olur.”*(Fussılət:35)”.

---

## Şərh:

Müəllifin (rahiməhullah) bu sözləri çox əzəmətli, gözəl və doğru sözlərdir.Şeyx (rahiməhullah) deyir: Batil əhlinə iki cəhətdən cavab veriləcək: Yığcam və ətraflı cavab.Çünki müşriklərdən olan batil əhli avam insanlara bir çox işlər vasitəsilə şübhələr atmışlar.Habelə onlar həmin şübhələri şeyxin əleyhinə dəlil gətirmiş və qəbir sahiblərinə dua etmək, ölülərdən, mələklərdən və cinlərdən yardım diləmək kimi batil yollarını doğru göstərmək üçün onunla bu mövzuda yazışmışlar. Şeyx isə onlara yığcam və müfəssəl cavab vermişdir.

Yığcam cavab hər bir şübhəyə verilir və bəsirət sahibi alim və digər şəxs üçün cavab olaraq yarayır.Belə ki, etdiklərinin şirk olmadığını və övliyalara yaxud peyğəmbərlərə

tapınmağın şirk olmadığını və onların ad-san və şəfaət sahibləri olduğunu, habelə Allahın, onlara dua edənlərə yaxud onlardan yardım diləyənlərə onları şəfaətçi edəcəyini iddia edən şəxsə deyəcəksən: Mən sənə ətraflı və aydın bir söz dedim.Dedim ki, Uca Allah şirki və Allahdan qeyrisinə dua etməyi haram etmiş, habelə müşriklərin ölülərə dua etmələri və ölülərdən yaxud peyğəmbərlərdən yaxud cinlərdən yaxud ulduzlardan yaxud başqasından yardım diləmələri səbəbilə onlara şirk və küfr hökmünü vermişdir.Bu, Quran, sunnə və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) həyat tərzindən bəlli olan bir işdir.Sənin mənə, onların Allah qatında ad-sana sahib olmalarını yaxud onların şəfaətə sahib olmalarını yaxud peyğəmbərlərin şəfaətə sahib olmalarını deməyin, şirk olaraq qeyd etdiyim sözlərə dəlalət etdiyini anlamıram.Habelə bunun həmin nasslardan olduğunu bilmirəm.Allahın kəlamı ziddiyətli deyil.Habelə Peyğəmbərin sözləri Allahın sözlərinə müxalif deyil.Uca Allah batil əhlinin aydın olmayana (mütaşabihə) uyduqlarını və aydın olanı (möhkəmi) tərk etdiklərini xəbər vermişdir.Sənə isə, Uca Allahın şirk və Allahdan qeyrisinə dua etmək kimi işləri haram etdiyinə dair bəyan etdiyi möhkəm və açıq-aydın olanı götürməyin vacibdir.Uca Allah buyurur: *“Həqiqətən, Allaha şərik qoşmaq böyük zülmdür.”*(Loğman:13) Habelə buyurur: *“Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: Əgər şərik qoşsan, əməlin puç olacaq və mütləq ziyana uğrayanlardan olacaqsan.”*(əz-Zumər:65) Habelə buyurur: *“Şübhəsiz ki, məscidlər Allahındır.Allahdan başqa heç kəsə dua etməyin!”*.(əl-Cinn:18) Habelə: buyurur: *“Kim Allahla yanaşı, haqqında özünün heç bir dəlili olmadığı başqa bir ilaha ibadət edərsə, onun cəzasını Rəbbi Özü verəcəkdir. Şübhəsiz ki, kafirlər nicat tapmazlar!”*.(əl-Muminun:117) Habelə buyurur: *“Bu sizin Rəbbiniz olan Allahdır.Mülk Onundur.Sizin Ondan başqa yalvardıqlarınız xurma çəyirdəyinin pərdəsinə*

*belə sahib deyillər.Əgər siz onları çağırsanız, onlar sizin duanızı eşitməzlər, eşitsələr də cavab verə bilməzlər.Özləri də qiyamət günü sizin onlara ibadət etdiyinizi danacaqlar."* (Fatir:13-14) Habelə buyurur: *"Onlar Allahı qoyub özlərinə nə bir zərər, nə də bir fayda verə bilməyənlərə ibadət edir və: Onlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!-deyirlər."* (Yunus:18) Habelə buyurur: *"Allahı qoyub başqalarını özlərinə dost tutanlar: Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!,-deyirlər.".*(əz-Zumər:3) Bütün bu ayələr, möhkəm və aydındır.Belə ki, Uca Allah onların şübhəsini puç etmiş, onların sözlərini rədd etmiş, onların küfrünü və həmin məbudların Allaha yaxınlaşdırdıqlarına və şəfaətçilik etdiklərinə dair irəli sürdükləri iddianın batil olduğunu, onun onlara heç bir fayda verməyəcəyini və heç bir şeydə onların dadına çatmayacağını bəyan etmişdir.Sənin isə, həmin möhkəm və açıq-aydın sözlərdən tutunmağın və qəsd etdiyinə dəlalət etməyən şeylərə yapışmağı tərk etməyin gərəkdir. Məsələn ayələrdən biri budur: *"Şübhəsiz ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar kədər içində olmazlar".* (Yunus:62) Bəli, onlar Allahın dostlarıdır.Lakin bu ayə, nəyə dəlalət edir? Allahı buraxıb onlara dua etməyinə dəlalət edir? Allahın dostlarına bir qorxu yoxdur və onlar kədər içində olmazlar.Bəli, bu doğrudur.Lakin bu, Allahı buraxıb onlara dua etməyi, onlardan yardım diləməyi və onlara nəzr etməyi ifadə etmir.

Bütün peyğəmbərlərə və saleh insanlara qorxu yoxdur və onlar kədər içində olmazlar.Onların hamısı Allahın dostlarıdır.Lakin onlara dua edilməz.Onların əməlləri, təqvası və ibadəti özləri üçündür.Onlar Allahın itaətində durduqları üçün onlara qorxu yoxdur və onlar kədər içində olmazlar. Sənin onlara dua etməyin isə yaramaz işdir.Bu, heç də doğru deyil.Qiyamət günü onlar şəfaət edəcəklər, habelə Pey-

ğəmbər qiyamət günü şəfaət edəcək və o, Allah qatında ad-sana sahibdir.*"O, Allah yanında çox ehtiram edilən şəxsdir"*.(əl-Əhzab:69) Yəni, Musa peyğəmbər.Peyğəmbərin ad-sanı isə bütün bu şeylərdən daha böyükdür.Lakin bütün bi işlər şirkin icazəli olduğuna dəlalət etmir.Peyğəmbərin ad-sanı böyükdür.Allahın dostlarının həmçinin ad-sanı və Allah qatında dərəcələri vardır.Habelə onların qiyamət günü şəfaəti vardır.Lakin kim sənə deyir ki, bundan ötrü Allahı buraxıb onlara dua etmək olar.Bu, batıldir.Batil tapınmadır.Onların şəfaəti və kəraməti onlara aiddir.Onlar yalnız Allahın, sözü və əməlindən razı qaldığı şəxslərə şəfaət edə bilərlər. Müşrikin sözü və əməlindən isə Uca Allah əsla razı qalmır.Bu üzdən onlar bu adamlara şəfaət edə bilməzlər.Uca Allah buyurur: *"Küfr etsəniz, bilin ki, Allah sizə möhtac deyildir.O, qullarının kafirlik etməsinə razı olmaz."*(əz-Zumər:7) Uca Allah kafirlərin qəzəbə düçar olduqlarını və zəlalətdə vurnuxduqlarını xəbər vermişdir.Bu üzdən onlar üçün şəfaət yoxdur. Bütün bu dəlillər, möhkəm və açıq-aydındır.

Kafirə şəfaət edilməz.Habelə Allahın bu dostlarının ad-sana sahib olmalarına dair kafirin etiqadı ona heç bir fayda verməz.Onların ad-sanı və saleh əməlləri onlara aiddir.Onlara tapınan adamlara isə bu heç bir fayda verməyəcək.Habelə peyğəmbərlərin əməlləri və təqvası onlara aiddir.Onların əməli-saleh olmaları yaxud övliya olmaları yaxud peyğəmbər olmaları müşrikə fayda verməz.Çünki onun şirki əməlini puça çıxarır. *"Əgər Ona şərik qoşsaydılar, əlbəttə, etdikləri əməllər puç olardı"*.(əl-Ənam:88) Şirk əməli puça çıxarır.İnsanın, peyğəmbəri yaxud övliyanı yaxud ulduzu yaxud cini yaxud bütü Allaha şərik qoşması eynidir.Beləsinin əməli puça çıxır. Onların peyğəmbərlər yaxud övliyalar olması etibarı ilə onlara tapınmaq bütövlüklə batildir.Onlar peyğəmbərlər və övliyalardır.Lakin onlara tapınmaq olmaz.Habelə mələklərə,

cinlərə, bütlərə, ulduzlara və digər şeylərə tapınmaq olmaz. Bütün bu işlər elm, iman və bəsirət əhli üçün aydındır. Lakin elmin azlığı və bəsirətin yoxluğu səbəbilə bu kimi işlər bəzi insanlara qaranlıq qalır.Ancaq bunun yaxşı cavab olduğunu bilməyin lazımdır.Həmin cavab sənin belə deməyindir: Mən sənə möhkəm bir dəlil gətirəcəm və sənə aydın bir məsələni izah edəcəm.Sənə yaxud mənə qaranlıq qalan məsələni isə burax! Uca Allah bizə xəbər vermişdir ki, qəlblərində əyrilik olanlar aydın olmayana (mütaşabihə) uyurlar.Mütaşabihi kənara qoy! Haydı, birlikdə Uca Allahın bəyan etdiyi möhkəm ətrafında birləşək.Uca Allah buyurur: *“Onlar Allahı qoyub özlərinə nə bir zərər, nə də bir fayda verə bilməyənlərə ibadət edir və: Onlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!-deyirlər.”*(Yunus:18) Habelə buyurur: *”Allahı qoyub başqalarını özlərinə dost tutanlar: Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!,-deyirlər.”*.(əz-Zumər:3) Bu, onlara cavab olaraq açıq-aydın dəlillərdir.*“Kim Allahla yanaşı, haqqında özünün heç bir dəlili olmadığı başqa bir ilaha ibadət edərsə, onun cəzasını Rəbbi Özü verəcəkdir. Şübhəsiz ki, kafirlər nicat tapmazlar!”*.(əl-Muminun:117) *Allahdan başqa heç kəsə dua etməyin!”*.(əl-Cinn:18) *“Dini xalis Allaha aid edərək ibadət et!”*.(əz-Zumər:2) Habelə digər dəlillər.Allah hamını müvəffəq etsin!

## Suallar:

**Sual: Uca Allah buyurur:** *“Şübhəsiz ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar kədər içində olmazlar”*.(Yunus:62) Bu ayədə övliyalara tapınmağın caiz olduğuna dair onların dediyi sözə dəlalət edən hər hansı bir amil varmı?

Cavab: Xeyir! Bu ayədə övliyalar tərifl ənir.Çünki onlar iman gətirib müttəqilərdən olmuşlar.Məgər onlar tərifləndiyi zaman Allahdan başqa onlara ibadət edilir? Peyğəmbərlər həmçinin tərifl ənmişlər.Çünki onlar Allaha itaət edib Allahın risalətlərini insanlara çatdırmışlar.Bu, onların əməlidir və onların əməli özlərinə aiddir.

Sual: Bəzi insanlar Mədinə şəhərində Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qəbiri önündə əllərini qaldırır.Beləsinin özü üçün dua etməsi haqqında gözəl zəndə olmaq doğrudurmu?

Cavab: Bu, onun tərəfidən olan cahillikdir.Beləsi dua etmək istədiyi zaman özünü və başqalarını təşvişə salmaması və onun Peyğəmbərə dua etdiyi zənni yaranmaması üçün ona qibləyə yönəlmək yaxud digər bir yerə getmək tövsiyəsi edilməlidir.

Sual: İmam Əhmədin yalnız Peyğəmbər (salləllahu aleyhi və səlləm) ilə təvəssül etməyi caiz görməsinə dair rəvayət olunan səhihdirmi?

Cavab: Bu, rəvayət olunur.Lakin ondan və başqalarından məşhur olan, bunun yasaq olmasıdır.Cumhur bunun yasaq olduğu görüşündədir.Lakin hətta imam Əhməd və başqaları bunu desələr bu, yanlış fikir olacaq.

Sual: Kafir müşrik olurmu?

Cavab: Hər kafir müşrikdir.Hər müşrik isə kafirdir.

Sual: Bəs münafiq?

Cavab: Münafiq küfr baxımından daha açınacaqlı haldadır. Allah qorusun! Münafiq, qəlbində İslama qarşı düşmənçilik bəsləyən və İslama küfr edən şəxsdir.Münafiq budur. *“Həqi-*

*qətən, münafiqlər atəşin ən aşağı təbəqəsində olacaqlar".* (ən-Nisa:145) .Allah qorusun!

Sual: Allahın dostları kimlərdir?

Cavab: İnşallah siz onlardansızın.Allah bizi və sizi onlardan etsin! Allaha və Peyğəmbərə itaət edən və haqq üzərə doğru-dürüst olan hər bir şəxs Allahın dostlarındandır.Allahdan bizi və sizi onlardan etməsini diləyirik!

Sual: Bəzi insanlar hesab edirlər ki, bəzi günahlar insanı şirkə salır.Onlar deyirlər: Bu adamlar etdikləri işləri Allah-dan daha çox sevirlər.

Cavab: Vacib olan, ibadəti sevməkdir.Lakin Allahdan çox zövcəni yaxud mal-mülkü sevmək günahlardan biridir.Lakin Allaha sevginin yoxluğunu gərəkdirən hər bir sevgi böyük küfrdür.Allah qorusun! Sevginin özəyinin olması labüddür. Lakin Allaha olan sevgi hər bir şeydən daha kamil olmalıdır. Habelə Peyğəmbərə (salləllahu aleyhi və səlləm) olan sevgi daha kamil olmalıdır.Bu, imanın vacib kamilliyindəndir. "Hər kimdə üç xislət olarsa imanın şirinliyini dadar: Allah və Peyğəmbəri ona başqalarından daha sevimli olarsa".[14] Bu, tövhidin kamilliyidir.Allaha və Peyğəmbərə olan sevgi, baş-qalarına olan sevgidən daha kamil olmalıdır.

Sual: Biri şeyxini çox sevdiyi üçün onun sözlərini Allahın və Peyğəmbərin sözünün önünə çəkmişdir.

Cavab: Bu, günah və kor-koranə təqliddir.İnsan bunu halal sayacağı və şeyxinin sözünün Allahın və Peyğəmbərin sözündən öndə olacağını etiqad edəcəyi zaman bu, böyük küfr olacaq.Bunu halal sayacağı zaman.Allah qorusun!

---

[14] Buxari, kitəbul imən, bəbu haləvətil imən:16-cı hədis.Muslim, kitəbul imən, bəbu bəyəni xisali mən ittəsafə bihinnə vacədə haləvətal imən:43-ci hədis.

Sual: Şirk əməllər edib: Biz onlara övliyalar, salehlər və ölülər olmaları etibarı ilə ibadət etmirik,-deyən şəxsin hökmü nədir?

Cavab: Biz onlara ibadət etmirik deyərsə belə fərq etməz.Onlar deyirlər: *Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!".*(əz-Zumər:3) Bizim qəsdimiz Allaha ibadət etməkdir.Lakin bunlar bizi Allaha yaxınlaşdırırlar. Onlar ibadətə layiq deyillər, onlar sadəcə vasitəçilərdir.Onlar bu cür iddialarla çıxış edirlər.

Sual: Qurban kəsməyin və nəzr etməyin ibadət olduğunu bilməyən şəxsin hökmü nədir?

Cavab: Cahil öyrədilir.Bilməyən şəxsə başa salınır.

Sual: Beləsinə şirk hökmü çıxarılırmı?

Cavab: Ona şirk hökmü çıxarılır və başa salınır.Məgər Uca Allahın növbəti ayəsini eşitməmisən: *"Yoxsa elə hesab edirsən ki, onların əksəriyyəti eşidəcək və ya anlayacaq?".*(əl-Furqan:44) Heyvanlar anlayırmı? *"Onlar heyvan kimidirlər, hətta, haqq yoldan daha çox uzaqlaşmışlar."*(əl-Furqan:44) Habelə Uca Allah buyurur: *"Biz cəhənnəm üçün bir çox cinlər və insanlar yaratdıq.Onların qəlbləri var, onunla anlamazlar; gözləri var, onunla görməzlər; qulaqları var, onunla eşitməzlər.Onlar heyvan kimidirlər, hətta daha çox azğınlıqdadırlar.Qafil olanlar da məhz onlardır."*(əl-Əraf:179) Onlara bundan daha böyük danlaq ola bilərmi?! Allah qorusun!

Sual: Məgər bu ayə dəlil deyil: *"Şübhəsiz ki, Biz ona yol göstərdik! Fərqi yoxdur, ya şükür etsin, ya da naşükür olsun."* (əl-İnsən:3)?

Cavab: Bəli, uyğun gəlir.Yəni, hidayət verib ona yolu göstərdik.Ona yolu açıqladıq.Habelə peyğəmbərlər açıqladılar. Həqiqi alimlər açıqladılar.Lakin zəlalətdə olan şəxs üz çevirir, buna fikir vermir və heç vecinə belə almır.Bədəvi və Hüseynə ibadət edənlərin yanına gəldiyin zaman sənə: Xeyir! Biz sənə itaət etməyəcəyik.Məhz bizim yolumuz haqqdır,-deyir.

Sual: Zındığın tövbəsi qəbul olunurmu?

Cavab: Özü ilə Allah arasında sadiq olub Allaha tövbə edəcəyi zaman tövbəsi doğru olacaq.

Sual: Avam insanların şirk etdiklərini, qəbirləri təvaf etdiklərini yaxud onlara qurbanlar kəsdiklərini yaxud nəzr etdiklərini görüb buna susan alimlərin küfrə düşmələrini demək olarmı?

Cavab: Belə deyilməz.Onlar yaltaqlıq edirlər və bu səbəbdən cinayət edirlər.Onların susması cinayətdir.Lakin onlar (susmaqla) doğru etdiklərini hesab edəcəkləri zaman təkfir olunacaqlar.Onlar, etdiklərinin doğru olduğunu və doğru qərar verdiklərini etiqad edəcəkləri zaman təkfir olunacaqlar.

Sual: Lakin onlar bunun açıq-aydın şirk olduğunu bilirlər.

Cavab: Hətta bilsələr belə, bu, yaltaqlıq və səhlənkarlıq üzündən baş verir.

Sual: Peyğəbmərin ad-sanı ilə istəməyin hökmü nədir.Bu, bidətdirmi?

Cavab: Bəli, bidətdir.

Sual: Ölülər üçün Quran oxumaq məsələsi.Elm əhlindən bəziləri demişlər: Onun savabı ölüyə çatır.Bu məsələyə dair doğru görüş nədir?

Cavab: Doğru olan savabın çatmamasıdır.Şeyx Təqiyuddin çəkişməsiz olaraq savabın çatmadığını qeyd etmişdir. Quran oxunuşu ölüyə çatmır.Habelə bundan ötrü pul-para almaq icazəli deyil.Çünki Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) onun ölüyə çatmasına dəlalət edən heç bir dəlil varid olmamışdır. Varid olan yalnız sədəqələr, həcc və ümrə vasitəsilə Allaha ibadət etməkdir.Bunun savabı ölüyə çatır və ölüyə fayda verir.Qaldı ki, ölünün adından yaxud ölü üçün Quran oxumaq məsələsinə, buna dair heç bir dəlil yoxdur.Ancaq onlar üçün edilən dua onlara fayda verir.Buna dair dəlil gəlmiş və müsəlmanlar bu işdə icma etmişlər.İbadətlər isə təuqifidir.

Sual: Səudiyyəlilərin vəhhabilər və təəssübkeşlər olduqlarını deyənə necə cavab verilməlidir?

Cavab: Ona de: Bəli, dediyin vəhhabilər həqiqi müsəlmanlardır.Onlar təəssübkeş deyillər.Sən isə cahilsən və haqqı bilənəcən öyrədilməlisən.Haqq kişilər ilə tanınmır.Lakin kişilər haqq ilə tanınır.Dəlilləri araşdır və onun barədə düşün! Əsas odur və hər şey onun ətrafında cəmləşir.Muhammədin (salləllahu aleyhi və səlləm) davamçıları təəssübkeş deyillər.Təəssübkeşlər, batil əhlinin batil işlərinə tabe olan təqlidçilərdir. Çünki həmin batil əhli onların şeyxləri yaxud ata-babaları yaxud əshabıdır. Beləsi onları təzim edərək onlara tabe olur və təqlid edir.Təəssübkeş məhz budur.

## Müşrikin rübubiyyəti iqrar etməsi onun ibadətdə etdiyi şirkinə bəraət qazandırmır

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

İndi isə ətraflı cavab: Belə ki, Allahın düşmənləri peyğəmbərlərin dininə bir çox etirazlar irəli sürür və onun vasitəsilə insanları ondan (dindən) uzaqlaşdırırlar.Ondan birində deyirlər: Biz Allaha şərik qoşmuruq.Əksinə biz yalnız Bir və şəriksiz olan Allahın yaradan, ruzi verən, fayda və zərər verən olduğuna, habelə nəinki Abdul-Qadir və başqasının heç Muhammədin (salləllahu aleyhi və salləm) özünə nə bir fayda nə də ki, bir zərər vermək gücündə olmadığına şahidlik edirik. Lakin mən günahkar bəndəyəm.Saleh insanların isə Allah qatında ad-sanı vardır.Mən də, onlar vasitəsilə Allahdan diləyirəm.Bu zaman öncə qeyd edilən sözlərlə ona cavab ver. De ki, Peyğəmbərin savaş açdığı şəxslər sənin qeyd etdiyin işləri iqrar edirdilər.Onlar bütlərin heç bir işi idarə etmədiyini iqrar edirdilər.Onlar ancaq ad-san və şəfaət istəmişlər. Sən ona Uca Allahın Öz Kitabında qeyd edib açıqladığı sözləri oxu! Əgər həmin şəxs: Bu ayələr, bütlərə ibadət edən şəxslər üçün nazil olmuşdur,-deyərsə, ona öncə qeyd olunan sözlərlə cavab ver.Həmin şəxs, kafirlərin rübubiyyətin bütövlüklə Allaha məxsus olduğuna və qəsd etdiklərindən yalnız şəfaət istədiklərinə şahidlik etdiklərini iqrar edəcəyi lakin onların etdiyi ilə öz etdiyi arasında qeyd olunan amilə əsasən fərq qoymaq istəyəcəyi zaman ona xatırla ki, kafirlərdən bəziləri salehlərə və bütlərə, bəziləri isə Allahın xəbər verdiyi övliyalara dua etmişlər: *"Onların yalvardıqları məbudların özləri də*

*Rəbbinə-hansı daha yaxın olacaq deyə vəsilə axtarırlar."*(əl-İsra:57) Habelə Məryəm oğlu İsaya və onun anasına dua edirlər.Uca Allah buyurur: *"Məryəm oğlu Məsih ancaq bir peyğəmbərdir.Ondan əvvəl də peyğəmbərlər gəlib getmişdir. Onun anası isə Allaha sidq-ürəkdən inanan bir qadın idi.Onların hər ikisi (adi insanlar kimi) yemək yeyirdi. Gör Biz ayələri onlara necə başa salırıq, onlar gör necə üz çevirirlər. De: Allahı qoyub sizə nə bir zərər, nə də bir xeyir verən şeylərəmi ibadət edərsiniz? Halbuki Allah eşidəndir, biləndir!".*(əl-Maidə:75-76) Habelə ona bu ayəni xatırlat: *"O gün onları bir yerə yığacaq, sonra da mələklərə belə deyəcək: "Bunlar sizəmi ibadət edirdilər?"(Mələklər:) Sən paksan, müqəddəssən. Bizim ixtiyar sahibimiz onlar deyil, Sənsən! Xeyr, onlar (bizə yox) cinlərə ibadət edirdilər. Onların əksəriyyəti məhz onlara iman gətirmişdi", -deyə cavab verəcəklər."*(Səbə:40-41) Habelə buyurur: *"Xatırla ki, o zaman Allah belə buyuracaq: Ya Məryəm oğlu İsa! Sənmi insanlara: Allahla yanaşı, məni və anamı da özünüzə ilah tutun!"- demişdin? (İsa cavabında) deyəcək: "Sən paksan və müqəddəssən! Haqqım çatmayan bir şeyi demək mənə yaraşmaz. Əgər bunu mən demiş olsaydım, Sən onu mütləq bilərdin.Sən mənim ürəyimdə olan hər şeyi bilirsən, mən isə Sənin zatında olanı bilmirəm.Şübhəsiz ki, qeybləri bilən ancaq Sənsən!".*(əl-Maidə:116) Ardından ona söylə: İndi bildinmi ki, Uca Allah bütlərə tapınanları, habelə saleh şəxslərə tapınanları təkfir etmiş və Allahın Elçisi (salləllahu aleyhi və səlləm) onlara qarşı vuruşmuşdur? Əgər həmin şəxs: Kafirlər onlardan bir-başa istəyirlər.Mən isə fayda və zərər verənin və bütün işləri idarə edənin Allah olduğuna şahidlik edirəm. Mən yalnız Ondan istəyirəm.Salehlər isə özlüyündə heç bir şeyə qadir deyillər.Lakin onlara tapınmaqla Allahdan onların şəfaətini diləyirəm,-deyərsə, ona cavab olaraq söylə: Bu, eynilə kafirlərin sözləridir.Həmin adama Uca Allahın bu ayəsini

oxu: *"Allahı qoyub başqalarını özlərinə dost tutanlar: Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!,-deyirlər.".*(əz-Zumər:3) Habelə buyurur: "*Onlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!-deyirlər."*(Yunus:18)".

## Şərh:

Müəllif (rahiməhullah) yığcam cavabla başladıqdan sonra müfəssəl cavaba keçmişdir.Şeyx (rahiməhullah) şübhə əhlinə yığcam və ətraflı cavab verir.Çünki şübhə əhli müxtəlif olurlar. Onlardan bəzisi düşüncəli insan olur, belə olan halda təfsilata ehtiyac yaranır.Bəzisi isə cahil olduğu üçün ona yığcam şəkildə rəddiyə vermək kifayət edir.Mühüm olan, müşriklərdən olan Allahın düşmənləri şübhələrə sahibdirlər. Onlar həmin şübhələr vasitəsilə insanları peyğəmbərlərin dinindən uzaqlaşdırır və həmin şübhələr vasitəsilə onları çaşdırmağa çalışırlar.Bu səbəbdən, şeyx müşriklərə rəddiyə verərək ətraflı cavabı qeyd etmişdir.Həmin adamlar: Bizi əsli kafirlərlə bir sıraya qoymayın.Çünki onlar bütlərə, Hubəl və bu kimi digər bütlərə ibadət edirdilər.Biz isə bütlərə ibadət etmirik və yalnız salehlər, peyğəmbərlər və xeyirxah insanlar ilə təvəssül edirik,-deyəcəkləri zaman ona söylə: Sən eynilə onların etdiyini etdin.Onlar yalnız bütlərə ibadət etmirdilər. Onlar bütlərə, habelə peyğəmbərlərə və saleh insanlara ibadət edirdilər.Uca Allahın xəbər verdiyi kimi onlar Lata ibadət edirdilər.O isə, saleh insan olub.Habelə İsa və onun saleh anasına ibadət edirdilər.Habelə övliyalar və digər saleh insanlara ibadət edirdilər.Elə isə onlar sizin kimidirlər.Əgər həmin şəxs: Mən Allaha heç bir şeyi şərik qoşmuram,Mən Allahın yaradan, ruzi verən, işləri idarə edən, dirildən və

öldürən olduğunu bilirəm.Lakin mən onlardan şəfaət diləyir və onların məni Allaha yaxınlaşdırması üçün onları Allaha vəsilə tuturam,-deyərsə, ona söylə: Müşriklərin dinidə məhz budur.Sən, Bir olan Allaha ibadət et! Bütlərə, peyğəmbərlərə və saleh insanlara dua etmə, xeyir, Bir olan Allaha dua et! Sən peyğəmbərə yaxud saleh insana yaxud bütə yaxud ağaca dua etsən eynidir.Bütün bu işər Allaha şərik qoşmaqdır.Onlar saleh insanlar olacaqları zaman onların bu xüsusiyyəti sənə deyil onlara fayda verəcək.Onların saleh olmaları və əməlləri onlara aiddir.Lakin təvəssül xeyir işlərlə olur.Sən onları özünə örnək tutur, onlar namaz qıldığı kimi namaz qılırsan, onlar oruc tutduğu kimi oruc tutursan və ibadəti xalis Allaha aid etdikləri kimi ibadəti xalis Allaha aid edirsən.Onlar etdiyi kimi yaxşılığı əmr edir və pislikdən çəkindirirsən.Bu, onları örnək tutmaqdır.Onların etdiyi xeyir işləri edirsən. Ancaq Allah ilə yanaşı onlara dua edib: Ey Allahın Elçisi mənə yardım et yaxud xəstəmə şəfa ver! Yaxud ey Abdul-Qadir yaxud Əhməd Bədəvi yaxud Hüseyn yaxud Həsən yaxud Əli ağam!-deməyin daha sonra mənə: Mən onlara ibadət etmirəm lakin onlar saleh insanlar yaxud peyğəmbər-lər olduqları üçün onları çağırıb dua edirəm,-deməyin, eynilə Əbu Cəhlin, Utbə bin Rabia və digər Qureyş kafirlərinin ibadətidir.Bu, onların dinidir.Uca Allah onların belə didiyini xəbər vermişdir: *“Biz onlara yalnız bizi Allaha yaxınlaş-dırmaq üçün ibadət edirik!”*.(əz-Zumər:3) Bizim onlara ibadət etməyimiz onların yaradan və ruzi verən olduqları səbəbilə deyil.Xeyir! Bizi Allaha yaxınlaşdırsınlar deyə biz onlara ibadət edirik.Uca Allah onlar haqqında buyurur: *“Onlar Allahı qoyub özlərinə nə bir zərər, nə də bir fayda verə bilməyənlərə ibadət edir və: Onlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!-deyirlər.”*(Yunus:18) Uca Allah onlar barədə buyurur: *“Odur ki, şəfaət edənlərin şəfaəti onlara fayda*

*verməz."*(əl-Muddəssir:48) Çünki onlar onu (şəfaəti) lazım olan qaydada tələb etməmişlər.Şəfaəti istəyən şəxs onu Allahdan diləyib: Allahım peyğəmbərlərini mənə şəfaətçi et, saleh qullarını mənə şəfaətçi et!-deməlidir.Onların yolunu gedib ibadət etdikləri kimi ibadət etməli, onların dua etdiyi kimi dua etməli və onların Allahdan yardım dilədiyi kimi yardım diləməlidir.İnsan məhz bu cür Allaha ibadətdə və Onun əmrlərini yerinə yetirib qadağan etdiyini tərk etməkdə onların yolunu tutub getməlidir.Ancaq insanın Allahla bərabər onlara dua etməsi, onlardan yardım diləməsi, onlara nəzr etməsi, onlara qurban kəsməsi və onların qəbirlərini təvaf etməsi eynilə öncəki müşriklərin etdiyi əməldir.Bu, öncəki müşriklərin dinidir.Saleh insanları ortaqlar edib onlara dua edərək və onlardan yardım diləyərək və *"bunlar Allah qatında bizdən ötrü şəfaət edənlərdir"* deyərək onlara ibadət etməklə Allaha yaxınlaşmaq.Bu, eynilə öncəki müşriklərin sözləridir.Uca Allah buyurur: *"O gün onları bir yerə yığacaq, sonra da mələklərə belə deyəcək: "Bunlar sizəmi ibadət edirdilər?"(Mələklər:) Sən paksan, müqəddəssən. Bizim ixtiyar sahibimiz onlar deyil, Sənsən! Xeyr, onlar (bizə yox) cinlərə ibadət edirdilər. Onların əksəriyyəti məhz onlara iman gətirmişdi", -deyə cavab verəcəklər."*(Səbə:40-41) Habelə buyurur: *"Allahı qoyub qiyamət gününədək özünə cavab verə bilməyənə yalvaran kimsədən daha çox azmış kim ola bilər? Halbuki onlar, onların yalvarışından xəbərsizdirlər."*(əl-Əhqaf:5) Onlara edilən duadan qafildirlər.*"İnsanlar bir yerə toplanacaqları zaman"*, bütün insanlar *"onlara düşmən kəsiləcək və onların ibadətini inkar edəcəklər".*(əl-Əhqaf:6) Habelə Məsihə, anasına və saleh insanlardan olan qeyrilərinə ibadət edənlər haqqında demişdir: *"Onların yalvardıqları məbudların özləri də".*Yəni, müşriklərin çağırdıqları şəxslər.*"Rəbbinə-hansı daha yaxın olacaq deyə vəsilə axtarırlar, Onun rəhmətini umurlar,*

*əzabından qorxurlar".*(əl-İsra:57) Vəsilə: Allaha olan itaət vasitəsilə yaxınlaşmaqdır. *"Rəbbinə-hansı daha yaxın olacaq deyə vəsilə axtarırlar, Onun rəhmətini umurlar, əzabından qorxurlar".*Bu, onların durumudur.Onlar Allaha ibadət edir, Ona yaxınlaşır, Ondan qorxur və Ona ümid bəsləyirlər.Onlar peyğəmbərlər və saleh insanlardır.Sadiq olacağın və onlara tabe olmaq istəyəcəyin zaman onların əməllərini et! Onlara ibadət etmə! Onlar sənin mislində bəndədirlər.Onlar yaradılmış və ruzilənən şəxslərdir.Sənin də bunu iqrar etdiyin kimi onlar özlərinə nə zərər nə də ki, fayda verə bilməzlər.Onlar nə zərər, nə fayda vermək, nə öldürmək, nə həyat vermək nə də, diriltmək gücündə deyillər.Sən onların bu cür olduqlarını iqrar edəcəyin zaman sən də onların dua edib çağırdıqları Allahı çağır! Onların ibadət etdikləri Allaha ibadət et! Ona nəzr et, Ona qurban kəs, Onun üçün namaz qıl və oruc tut! Habelə onların etdikləri digər ibadətləri et! Onlar kimi olmağın və əcrə nail olmağın, habelə onların nail olduqları savab və qurtuluşa nail olmağın üçün bunu etməlisən.Bu, müəllifin zamanında və bizim zamanımızda, habelə müəllifin zamanından öncəki müşriklərin halıdır.Bu, onların durumudur. Habelə bu, Qureyşin zamanında, bundan öncəki insanların, Nuh tayfasının, Hud və Saleh tayfasının zamanında insanların etdiyi şirk olmuşdur.Nadir hallarda görmək olar ki, bir şəxs ibadət etdiyi məbudun yaradan və ruzi verən olduğunu desin.Bu, çox az rast gəlinən şirkdir.Bu, rübubiyyətdə olan şirkdir.Əksər müşriklər üluhiyyətdə, ibadətdə, mədəd diləməkdə, onlardan şəfaət diləməklə onlarla təvəssül etməkdə, onları Allaha yaxınlaşdırmalarını istəməkdə və onların xəstələrinə şəfa vermələrini diləməkdə şirkə düşmüşlər.Onlar özləri şəfa vermir lakin Allah qatında şəfaətçi durub onların xəstələrinə şəfa verir və qəbirlərdə çürümüş sümüklər olduqları halda Allahdan istəyirlər.Bu, böyük cəhalətdir.Ölən insa-

nın ruhu bədənindən çıxmışdır.O, özünə nə fayda nə də ki, zərər verə bilmədiyi bir halda sənəmi şəfaətçi olub şəfaəti ilə səni əzabdan və xəstəlikdən qurtaracaq?! Bu, böyük cəhalətdir.Allah qorusun!Allah hamını müvəffəq etsin!

## Suallar:

Sual: Namazda Peyğəmbərə: Allahummə salli alə Muhammədin tıbbil qulubi va dəvaihə: (Allahım qəlblərin şəfası və dərmanı olan Muhammədə salavat elə!)",- deyən şəxsin sözü doğrudurmu?

Cavab: Bu, doğru deyil.Bu, yığcam sözdür.Qəlblərin şəfası və dərmanı yığcam sözdür.Qəlblərin şəfası və dərmanı şəriətə tabeçiliklə hasil olmuşdur.Lakin bu sözlər onun, özlüyündə şəfa olduğu və özlünüydə dəva olduğu və fayda verib zərər yetirdiyi təəssüratını yaradır.Belə sözlər yaramır.İnsanlara doğru sözlər öyrədin.Məsələn: "Allahummə salli alə Muhammədin va alə əli Muhamməd kəmə salleytə alə İbrahimə va alə əli İbrahim". Yaxud: "Allahummə salli alə-n-nəbiyyil ummiy".

Sual: İnsan qəbirin fayda və zərər vermədiyini etiqad edəcəyi zaman Allaha yaxınlaşmaq məqsədilə qəbirin ətrafında təvaf edərsə bunun hökmü necə olacaq.Həmin şəxsə küfr hökmü çıxarılacaqmı?

Cavab: Onlar üçün namaz qılmaq mislindədir.Bəli bu, küfrdür.Üstəlik böyük küfrdür.Əgər insan onlar üçün namaz qılar yaxud onlara dua edər yaxud onlardan yardım diləyər yaxud onların şəfaətçi olduqlarını düşünərək onlara səslənər, onların yaradan və ya ruzi verən və ya işləri idarə edən

olduqlarını etiqad etmədən ona şəfaətçi olsunlar deyə onlara dua edərsə bu, böyük şirk olacaq.Lakin əgər insan təvaf edib bunun şəriətdə sabit olduğunu hesab edərsə və buna dair: Mən onları deyil Allahı qəsd edirəm, bu təvafımla Allahı qəsd edirəm,-deyərsə və Kəbə mislində bunun şəriətdə sabit olduğunu hesab edərsə, belə olan halda onun əməli bidət və şirkə aparan vasitə olacaq.Lakin bu, nadir hallarda baş verir. Əsasən təvaf edənlər, bununla qəbir sahibinə yaxınlaşmağı qəsd edirlər.

Sual: Yeni mənzilin kəndarında qurban kəsməyin hökmü nədir?

Cavab: Bunu öncələr edirdilər.Həmin əməl böyük şirkdir. Çünki bu, cinlərə edilən ibadətdir.

Sual: Əgər məqsəd cinlərə yaxınlaşmaq olmazsa necə?

Cavab: Məlum olan budur ki, onlar bununla cinləri qəsd edir və deyirlər: Şəri bizdən uzaq olsun deyə onlara qurban kəsirik.Bizə evimizdə zərər verməsinlər deyə onlara qurban kəsirik.Bu, cənubdə mövcud olmuşdur.Lakin inşallah artıq bu yox olub bitmişdir.

Sual: Bir çox tələbələr şirkin, ölülərdən ehtiyac duyulan şeylər istəmək olduğunu anlayırlar.Ancaq onlardan şəfaət diləyəcəyi zaman onlardan dua istəmiş olacaq.Yəni, ölülərdən.O, deyir: Bu, böyük şirk deyil və sacədə bidətdir.

Cavab: Xeyir! Bu, böyük şirkdir.Çünki onlar həmin insana dua etmək və ona şəfaətçi olmaq iqtidarında deyillər.Onlar hamısı öz əməllərinin girovudurlar.Dua və şəfaət sağ ikən olur.Bu səbəbdən, Ömər və səhabələr yağmur dilədikləri zaman onlara şəfaətçi olsun deyə Peyğəmbərə (salləllahu aleyhi və səlləm) müraciət etmədilər.Onlar bunu dua vasitəsilə Abbas-

dan və Yezid bin əl-Əsvəddən istədilər.Əgər bunu etmək şəriətdə sabit olsaydı onlar Peyğəmbərə müraciət edər və qəbirdə ikən ona: Ey Allahın Elçisi, bizim üçün dua et!- deyərdilər.

## Üluhiyyət tövhidi gerçəkləşməyincə rübubiyyəti etiraf etmək kifayət etmir

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Bil ki, bu üç şübhə onların sahib olduqları ən böyük işlərdir.Uca Allahın onu Öz Kitabında açıqladığını biləcəyin və onu yaxşı anlayacağın zaman ondan sonra gələn daha asan olacaq.Əgər həmin şəxs: Mən yalnız Allaha ibadət edirəm. Salehlərə pənah aparmağım və onlara dua etməyim ibadət deyil,-deyərsə, ona söylə: Allahın sənə ibadəti xalis Ona aid etməyi vacib etdiyini və bunun sənin üzərində olan haqq olduğunu iqrar edirsənmi? Əgər o: Bəli!-deyərsə, ona söylə: Allahın sənin üzərində etdiyi bu vacibi, yəni ibadətin xalis Allaha aid edilməsini və sənin üzərində olan haqqı mənə açıqla! Əgər həmin şəxs ibadəti və onun növlərini bilməzsə növbəti sözləri deməklə onu həmin adama bəyan et.Uca Allah buyurur: *“Rəbbinizə acizanə, həm də gizlicə dua edin! Şübhəsiz ki, O, həddi aşanları sevmir.”*(əl-Əraf:55) Bunu ona çatdıracağın zaman ona söylə: Bunun Allaha ibadət olduğunu bildinmi? Həmin şəxsin: Bəli!-deməsi labüddür.Dua ibadətin beyinidir.Ona de: Onun ibadət olduğunu iqrar etdiyin və qorxaraq və ümid bəsləyərək Allaha gecə və gündüz dua etdiyin, daha sonra bir ehtiyac üçün peyğəmbərə yaxud qeyrisinə dua etdiyin zaman həmin ibadətdə qeyrisini Allaha şərik qoşmuş olursanmı? Onun: Bəli!-deməsi labüddür.Elə isə ona de: Uca Allahın: *“Rəbbin üçün namaz qıl və qurban kəs”*,-sözlərini biləcəyin və Ona itaət edib qurban kəsəcəyin zaman bu, ibadət olacaqmı? Onun: Bəli!-deməsi labüddür.Ona de: Sən peyğəmbərə yaxud cinə yaxud başqa bir məxluqa qurban

kəsəcəyin zaman Allaha bu ibadətdə qeyrisini şərik qoşmuş olacaqsanmı? Onun bunu iqrar edib: Bəli!-deməsi labüddür. Həmçinin ona de: Barəsində Quran nazil olan müşriklər mələklərə, saleh insanlara, Lata və başqalarına ibadət etmirdilər-mi? Onun: Bəli!-deməsi labüddür.Ona de: Məgər onların, adı çəkilənlərə ibadət etmələri yalnız dua, qurban kəsmə, pənah aparma və bu kimi şeylər deyildi? Buna rəğmən həmin insanlar Allahın qulları və Onun hökmü altında olduqlarını və Allahın hər bir işi idarə etdiyini iqrar edirdilər.Lakin onların ad-sanı və şəfaəti səbəbilə onlara dua etmiş və onlara pənah aparmışlar. Bu, çox aydın bir məsələdir."

## Şərh:

Onların sahib olduqları ən böyük bu üç şübhənin batilliyi bəlli olacağı zaman bundan sonra olanın daha yüngül olduğunu biləcəksən.

Artıq həmin üç şübhə qeyd edilmişdir: Növbəti sözlər: Müşriklər Allaha yaratmaq və ruzi vermək xüsusiyyətlərində şərik qoşurlar.Mən isə heç bir şeydə şərik qoşmuram və etiqad edirəm ki, yaradan və ruzi verən Allahdır.Artıq ona bəlli olmuşdur ki, onlar yaratma v.s xüsusiyyətində Allaha şərik qoşmamışlar.Onlar Allahın yaradan və ruzi verən olduğunu bilirlər.Habelə növbəti sözlər: Şirk, bütlərə ibadət etməkdir. Artıq ona bəyan etmisən ki, müşriklər həm bütlərə həm də büt olmayan şeylərə ibadət etmişlər.Habelə növbəti sözlər: Mən saleh insanlara ibadət etmirəm.Mən yalnız şəfaətçi olsunlar deyə onlara yaxınlaşıram.Ona de: Bu, müşriklərin məqsədi olmuşdur.Onlara, yaradıb ruzi verdiklərinə görə ibadət etməmişlər.Onlara yalnız həmin adamlara şəfaətçi

olsunlar, onlara yaxınlaşsınlar və Allaha yaxınlaşdırsınlar deyə ibadət etmişlər.Sənin etdiyin eynilə müşriklərin etdiyidir.

Artıq bu şübhələrin batilliyi bəlli olmuşdur.Bəlli olmuşdur ki, müşriklər Allahın yaradan, ruzi verən və onların Rəbbi olduğunu iqrar edirlər.Onların etdiyi şirk başqa işlərdə, Allahdan qeyrisinə ibadət vasitəsilə yaxınlaşmaqda olmuşdur.Habelə bilmisən ki, müşriklərin şirki bütlərə ibadət etməklə məhdudlaşmır.Onlardan bəzisi bütlərə, başqaları mələklərə, digərləri peyğəmbərlər və saleh insanlara ibadət edirdilər.Habelə yalnız Allah yanında yaxınlaşdırsınlar və şəfaətçi olsunlar deyə onlara ibadət etdiklərini bilmisən.Bu, öncəki insanların məqsədi olduğu kimi həmçinin bunların məqsədi olmuşdur.

Bu üç şübhənin batil olduğunu biləcəyin zaman ondan sonra olanın daha asan olacağını biləcəksən.Məlum olduğu kimi öncəki müşriklər Allahın yaradan, ruzi verən və işləri idarə edən olduğuna inanırdılar.Buna rəğmən Uca Allah onların kafir olduğuna hökm çıxarmış və Peyğəmbər (salləllahu aleyhi və səlləm) onlara qarşı vuruşmuş, habelə onların qanları və mallarının toxunulmazlığını ləğv etmişdir.Onlardan sonra gələnlər həmçinin eyni hal üzərədirlər.Əgər bir insan: Mən yalnız Allaha ibadət edirəm,-deyərsə, ona söylə: Allaha ibadət sözünün mənası nədir, mənə izah elə? Əgər o: Mən Allahın yaradan və ruzi verən olduğunu iqrar edirəm,-deyərsə, de: Artıq qeyd edilmişdir ki, müşriklər bunu iqrar edirdilər.Onlar Allahın yaradan və ruzi verən olduğunu və onların Rəbbi və işləri idarə edən olduğunu iqrar edirdilər.Əgər həmin insan: Mən yalnız Allaha ibadət edirəm, lakin salehlərin şəfaətçi və Allaha yaxınlaşdıran olduqlarını etiqad edirəm,-deyərsə, de: Bu, öncəki müşriklərin şirkidir.Bizə Allaha ibadəti izah elə!

Həmin insan: Allaha ibadət etmək, Ona dua etməyim, ondan hidayət və ruzi diləməyimdir,-deyərsə, ona söylə: Bu, sənin iman gətirdiyin və Allaha ibadət olduğunu iqrar etdiyin ibadətdir.Sən Ondan ruzi, şəfa və mədəd diləyərək səslənəcəyin zaman bu, ibadət olacaq.Onu Allahdan qeyrisinə yönəldəcəyin, onu övliyadan, bütdən, cindən və mələkdən diləyəcəyin zaman məgər bu ibadətlə Allaha şərik qomayacaqsan?! Onun bunu iqrar etməsi labüddür.Həmçinin namaz və qurban.Bir insan Allah üçün namaz qılacağı və qurban kəsəcəyi zaman bu, ibadət olacaqmı? Onun: Bəli!-deməsi labüddür.Allahdan qeyrisinə qurban kəsəcəyi, bütlər üçün dəvə yaxud inək yaxud qoyun kəsəcəyi yaxud onun üçün namaz qılacağı yaxud səcdə edəcəyi zaman məgər bu, ona ibadət olmayacaq? Onun: Bəli-deməsi labüddür.

Bununla da, müşriklərin şübhələrinin batil olduğu bəlli olur.Habelə həmin şübhələri ətraflı izah edən, ona diqqət yetirən və onlarla hikmətlə və gözəl üslubla münaqişə edən şəxs vasitəsilə Allahın hidayət vermək istədiyi şəxslərə məsələ aydın olar.Allahın bədbəxtçiliyə düçar etmək istədiyi şəxsin halı isə çox acınacaqlıdır.Uca Allah belələri barədə buyurur: *“Lakin iman gətirməyən adamlara dəlillər və xəbərdarlıqlar heç bir fayda vermir.”* (Yunus:101) Habelə Uca Allah buyurur: *“Həqiqətən, sənin Rəbbinin sözü özlərinin əleyhinə doğru çıxmış kimsələr iman gətirməzlər.Onlara ayələrin hamısı gəlsə belə, ağrılı-acılı əzabı görməyincə iman gətirməzlər.”* (Yunus:96-97) Bədbəxtçiliyə məhkum olan şəxs isə heç bir fayda əldə etmir və yalnız danır və imtina edir. “*Onlara ayələrin hamısı gəlsə belə*” Əbu Cəhl, Utbə bin Rabia və onlar mislində olanlara ayələr gəlmişdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) onlara ayələri açıqlamışdır.Lakin onlar danaraq və inadkarlıq edərək kafir oldular.Uca Allah buyurur: *“Biz bilirik ki, onların dedikləri səni kədərləndirir.Əslində onlar səni yalançı*

*hesab etmirlər.Lakin zalımlar Allahın ayələrini inadla inkar edirlər."*(əl-Ənam:33) Məhz bu cür danırlar.Habelə Uca Allah fironun tayfası haqqında demişdir: *"Buna qəti inandıqları halda, haqsızcasına və təşəxxüslə onları inkar etdilər."* (ən-Nəml:14) Bir sözlə, Allahın bir çox düşməni Peyğəmbərin (salləl-lahu aleyhi və səlləm) gətirdiyi dinə şübhə səbəbilə deyil sadəcə danaraq və inadkarlıq edərək haqqı qəbul etmirlər.Onları buna, danma yaxud dinindən birdəfəlik çıxmış Bəlamın etdiyi tək mal-mülk sevgisi sövq edir.Allah qorusun! Bəlam Musanın doğru din ilə gəldiyini bilirdi. Buna rəğmən dünyanı axirətdən üstün tutaraq tayfasına itaət etmiş və haqqı tərk etmişdir.Nəticədə Uca Allah onu məhv etmiş və elm və imandan məhrum etmişdir.Allah qorusun!

Bir sözlə, müşriklər müxtəlif olurlar: Onlardan bir qismi cahildirlər.Bu, əksər insanların durumudur.Əksəriyyət cahillərdir.Uca Allah buyurur: *"Yoxsa elə hesab edirsən ki, onların əksəriyyəti eşidəcək və ya anlayacaq? Onlar heyvan kimidirlər".*(əl-Furqan:44) Bu, əksəriyyətin durumudur.Onlardan bir qismi isə danaraq, inadkarlıq edərək və təşəxxüs göstərərək kafir olurlar.Bunlar haqqın peyğəmbərlərin və möminlərin tərəfində olduğunu bilirlər.Lakin belə deyirlər: Mən bunlara tabe olan və bunların ardınca gedən deyiləm.Bu şəxslər təkəbbürlük, inadkarlıq və zalımlıq yaxud alacaqları maldan ötrü yaxud İslamı qəbul edəcəyi zaman əldən çıxacaq vəzifədən ötrü müsəlmanların ardınca getməyə razı olmurlar.Bu adamlar vəzifədən ötrü yaxud əldə edəcəkləri maldan ötrü yaxud qohum-əqrabaya olan sevgidən və onlarla birgə küfr üzərə olmaqdan ötrü İslamı tərk edirlər. Bu, Qureyş və digər kafirlərdən olan bir çox insanın durumu olmuşdur.Zülm, həsəd, danma və təkəbbürlük, onları haqqı inkar etməyə və ona narazı olmağa sövq etmişdir.Əbu Cəhl, Utbə bin Rabia, Şeybə bin Rabia və Peyğəmbərin əməsi Əbu Talib kimi digər

insanlar buna misaldır.Allah qorusun! Övliyalardan və qeyrilərindən şəfaət diləmək öncəki müşriklərin şirkidir.

## Suallar:

**Sual:** Bəzi müşriklər ibadətin Allaha olduğunu bilirlər.Lakin xalis Allaha edilməsi vacib olan həmin ibadəti bilmirlər.

**Cavab:** Bəli, onlar müxtəlif qismlərdir.Onların əksəriyyəti bilməyən cahillərdir.Bəziləri isə qeyd edildiyi kimi inadkarlıq edir.

Sual: İbadətin xalis Allaha aid edilməsi məsələsinə gəldikdə, onlar hamılıqla bunu iqrar edirlər.Bu, onlara fayda verəcəkmi?

**Cavab:** Elədir! Onlardan bəzisi cahildir.Düşünür ki, övliyalara dua etmək və onlardan yardım diləmək onu İslamdan çıxarmır və bu işlər qəbahətsizdir.Habelə onların duası məbudların müstəqil olmaları səbəbilə deyil.Onlar sadəcə vasitə olduqları üçün bunu edirlər.O, həmin vasitənin qəbahətsiz bir iş olduğunu zənn edir.Vasitə isə, böyük şirkdir.Nun tayfasının, Hud tayfasının, Saleh tayfasının və peyğəmbərlərin xalqlarından olan başqa müşriklərin etdiyi vasitə məhz budur.Onların hamısı deyirdi: *“Biz onlara yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!,-deyirlər.”.*(əz-Zumər:3) *“Onlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!-deyirlər.”*(Yunus:18)

**Sual:** Günümüzdə olan bəzi qəbirə tapınan insanlar yaxud müşriklər ibadəti namaz çərçivəsinə salırlar.Məhz bu səbəbdən onlar, qurban kəsmək, dua etmək, yardım diləmək və başqa bu kimi işlər etsələr belə Allahdan qeyrisi üçün namaz qılmırlar.

Cavab: Bu, cahillikdən irəli gəlir.Uca Allah buyurur: *“Rəbbin yalnız Ona ibadət etməyi buyurmuşdur.”*(əl-İsra:23) Habelə buyurur: *“Yalnız Məndən qorxun!”*.(ən-Nəhl:51) *“Yalnız Mənə ibadət edin!”*.(əl-Ənkəbut:56) *“Ey insanlar! Rəbbinizə ibadət edin!”*.(əl-Bəqərə:21) Xas olaraq namazı qeyd etməmişdir.Habelə buyurur: *“Mən cinləri və insanları yalnız Mənə ibadət etmələri üçün yaratdım.”*(əz-Zəriyat:56) Habelə buyurur: *“Rəbbinizə acizanə, həm də gizlicə dua edin! Şübhəsiz ki, O, həddi aşanları sevmir.”* (əl-Əraf:55) Habelə digər ayələr.

Sual: Bizim orada gənclərlə yığıncaqlarımız olur.

Şeyx: Fransada?

Sual verən: Bəli! Ey Şeyx, onlar heç bir şeyə inanmırlar.Onlar kommunistlər kimi yaradana, ruzi verənə və diriliş gününə inanmırlar.Onlar müşrikdirlərmi?

Cavab: Bu, şirkdən daha böyükdir.Çünki bu, küfr və ateizmdir.Onların küfrü Qureyşin küfründən daha böyükdür.Onlar yaradanı danır və Rəbbə, yaradana və ruzi verənə iman etmirlər.Onların küfrü daha böyükdür.Onlar deyirlər: *“Dünya həyatımızdan başqa heç bir həyat yoxdur; ölüb dirilirik və biz dirilməyəcəyik.”*(əl-Muminun:37)

Sual: Onları müşrik adlandırmaq olarmı?

Cavab: Onlar müşrik adlanırlar.Çünki onlar öz nəfsi istəklərinə ibadət edirlər.

Sual: Əgər biri qəbirin yanına gəlib qəbirdə olandan Allah qatında ona dua etməsini istəyərsə, onun hökmü nə olacaq?

Cavab: Bu, həmçinin şirkdir.Çünki ölü bunu etmək imkanına malik deyil.İnsan ölüyə: Mənə şəfaətçi ol, mənim üçün

Allaha dua et!-deyərsə, doğru görüşə görə şirk etmiş olacaq. Çünki ondan qadir olmadığı bir şeyi istəmişdir.

Sual: Bəziləri iddia etmişlər ki, bu, ibn Teymiyyənin görüşüdür.Bu, doğrudurmu?

Cavab: Xeyir! Bu, ibn Teymiyyədən sabit deyil.Əksinə ibn Teymiyyə bunun böyük şirk olduğunu açıq bildirmişdir.

Sual: Bu hədis səhihdirmi: "Dua ibadətin beyinidir."?

Cavab: Bu hədis zəifdir.Lakin "Dua ibadətin özüdür" hədisi səhihdir.Birinci hədis zəifdir lakin mənası doğrudur.Yəni, xalis dua.

Sual: Küfrün yalnız təkziblə olacağını deyənin hökmü nədir?

Cavab: Bu, cahildir, mürəkkəb cahildir.Əgər biri Allahı söyər yaxud yalan sayarsa kafir olmayacaqmı?!

Sual: Həmin adam dindən çıxmırmı?

Cavab: Bəli kafirə çevrilir.Küfrün təkzib etmə olduğunu görənlərin sözündən elə çıxır ki, təkzib etmədiyi sürəcə Allahdan qeyrisi üçün namaz qılan yaxud səcdə edən yaxud Allahı söyən şəxs təkzib etmədikcə kafir olmur.Allah qorusun!

Sual: Bəzi avam insanlar deyirlər: Allaha altı yaxud dörd ay yaxud uzun müddət dua etdim lakin mənim duamı cavabsız qoydu.Belə şəxsə: Səbir et! Ola bilsin ki, Uca Allah sənin üçün bundan daha xeyirlisini saxlamışdır,-deyilə bilərmi?

Cavab: Bəli, səbir etsin.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Elə bir müsəlman yoxdur ki, günah və qohumluq əlaqələrinin pozulması (mənasında) olmayan bir dua etdiyi zaman Allah ona həmin dua səbəbilə üçündən birini verməsin

sin.Ya onun duasını tezləşdirər, ya axirət gününə onun üçün saxlayar yaxud da, ondan onun mislində bir pisliyi dəf edər. İnsanlar: Elə isə çoxlu dua edək.Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Allah daha çox edər."[15] Allah müdrikdir, biləndir.Bəzən duanı gecikdirir. Çünki bəzən duanın qəbul olunması insana zərər yetirir.

Sual: Bəzi insanlar böyük şirk edən şəxsin arxasında namaz qılıb deyirlər: O, cahil müsəlmandır.Bunu deyib arxasında namaz qılırlar.Bu namazın hökmü nədir?

Cavab: İnsan onun böyük şirk edən müşrik olduğunu biləcəyi zaman, müsəlmanların icması ilə onun arxasında qıldığı namazı səhih olmayacaq.Onun müşrik olduğunu biləcəyi zaman.Lakin onun müsəlman olduğunu etiqad edərsə namazı səhih olar.

Müdaxilə: Kahinlərin arxasında namazın hökmü nədir?

Cavab: Onun arxasında namaz qılmaq olmaz.Çünki kahin müşrikdir.Bəzən insan sehrbazlara, münəccimlərə və bu kimi şəxslərə inanın, onları təsdir edir və nəticədə onlar mislində olur.

Sual: Qəbirin yanında Allaha dua etməyin hökmü nədir?

Cavab: Qəbirin yanında dua etmək bidətdir.

Sual: Tələbələrdən biri soruşub deyir: Müəllif növbəti sözləri dedikdə nəyi qəsd edir: "Dua ibadətin beyinidir." Dua tövhidin əsasıdırmı?

Cavab: Dua ibadətin beyinidir.Dua ibadətin özüdür.Uca Allah buyurur: *"Rəbbiniz dedi: Mənə dua edin"*.Daha sonra dedi: *"Mənə ibadət etməyə təkəbbür göstərənlər cəhənnəmə zəlil*

[15] Əhməd "əl-musnəd:3/18".Şueyb əl-Arnaut demişdir: İsnadı yaxşıdır.

***olaraq girəcəklər.”***(Ğafir:60) **Uca Allah onu ibadət adlandırmışdır.**

## Şəfaəti yalnız onun sahibi Uca Allahdan diləmək olar

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

"Əgər həmin insan: Sən Peyğəmbərin (salləllahu aleyhi və səlləm) şəfaətini inkarmı edir və ondan kənarmı durursan?-deyərsə, ona söylə: Onu inkar etmir və ondan kənar durmuram. Əksinə o, şəfaət edən və şəfaət etməyə izn veriləndir.Mən onun şəfaətinə nail olmağa ümid bəsləyirəm.Lakin şəfaət bütövlüklə Allaha məxsusdur.Uca Allah buyurur: *"De: Şəfaət bütünlüklə Allaha məxsusdur."*(əz-Zumər:44) Şəfaət yalnız Allahın izni olandan sonra hasil olur.Uca Allah buyurur: *"Onun izni olmadan Onun yanında kim şəfaət edə bilər."*(əl-Bəqərə:255) O, yalnız Allahın izni olandan sonra kiməsə şəfaətçi dura bilər.Uca Allah buyurur: *"Onlar yalnız Onun razı qaldığı şəxslərdən ötrü şəfaət diləyir"*.(əl-Ənbiya:28) O isə, yalnız tövhiddən razı qalır.Uca Allah buyurur: *"İslamdan başqa bir din axtaran şəxsdən, o din heç vaxt qəbul olunmaz"*.(Ali İmran:85) Şəfaətin bütövlüklə Allaha məxsus olacağı və yalnız Onun izni olandan sonra olacağı, habelə istər Peyğəmbər istərsə də, qeyrisi Allahın izni olmadan heç kəsə şəfaət edə bilməyəcəyi və Allahın yalnız tövhid əhli üçün izn verəcəyi bilindiyi zaman sənə bəlli olacaq ki, şəfaət bütövlüklə Allaha məxsusdur və mən onu Allahdan diləyib deyirəm: Allahım məni onun şəfaətindən məhrum etmə, Allahım onu mənə şəfaətçi elə!Əgər həmin şəxs: Peyğəmbərə (salləllahu aleyhi və səlləm) şəfaət verilib və mən onu Allahın əta etdiyi şəxsdən istəyirəm,-deyərsə, belə cavab veriləcək: Uca Allah ona şəfaəti vermiş sənə isə bunu (şəfaəti ondan istəməyi) qadağan etmişdir.Uca

Allah buyurur: *“Allahdan başqa heç kəsə dua etməyin!”*(əl-Cinn:18) Uca Allahın Peyğəmbəri sənə şəfaətçi etməsini diləyirsənsə, bu zaman Ona bu sözlərində itaət et: *“Allahdan başqa heç kəsə dua etməyin!”*(əl-Cinn:18) Habelə şəfaət Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) qeyrisinə də verilmişdir.Belə ki, mələklərin, erkən ölmüş uşaqların və övliyaların şəfaət edəcəyi sabit olmuşdur. Məgər sən: Allah onlara şəfaəti verib və mən onu onlardan istəyirəm,-deyirsən?! Əgər sən bunu desən, Allahın Quranda xəbər verdiyi kimi saleh insanlara ibadət etməyə dönmüş olacaqsan.Əgər: Xeyir!-desən, bu sözlərinin batilliyi üzə çıxacaq: Allah şəfaəti ona vermiş və mən onu Allahın əta etdiyi şəxsdən istəyirəm.”

## Şərh:

Müəllif (rahiməhullah) şəfaət məsələsinə geniş toxunub bu mövzuda çox gözəl və mətanətli sözlər söyləmişdir. Şeyx izahı tələb olunan məsələləri və şirk əhli üçün qəti hüccət olacaq şeyləri izah etmişdir.Əgər bir şəxs: Mən Peyğəmbərdən (salləllahu aelyhi və səlləm) şəfaət diləyirəm.Sən Peyğəmbərin şəfaətini inkarmı edir və ondan kənarmı durursan?-deyərsə, ona söylə: Xeyir! Mən onu inkar etmir və ondan kənar durmuram.Əksinə mən onu isbat edirəm.Peyğəmbərin şəfaəti vardır.Uca Allah ona, digər peyğəmbərlərə və mələklərə şəfaət vermişdir.Bütün bu işlər həqiqətdir.Lakin Allah onlara şəfaət vermiş sənə isə şəfaəti onlardan istəməyi qadağan etmişdir.O, xas olaraq Uca Allahın mülküdür.Uca Allah buyurur: *“De: Şəfaət bütünlüklə Allaha məxsusdur.”*(əz-Zumər:44) Şəfaət Allahın mülküdür, onu istədiyinə verir.Biz də onu Sahibindən diləyirik.Habelə Uca Allahın izni olmadan heç kəs

Onun yanında şəfaət edə bilməz. Uca Allah isə yalnız tövhid əhli üçün izn verir və yalnız onların əməllərindən razı qalır. Şəfaəti peyğəmbərdən yaxud erkən ölmüş uşaqdan yaxud mələkdən yaxud övliyadan istəmək, onu, şəfaətə sahib olmayandan istəmək anlamına gəlir.Onun Sahibi Uca Allahdır. *"De: Şəfaət bütünlüklə Allaha məxsusdur."*(əz-Zumər:44) Habelə bu əməl, insanı şirkə salır.Çünki onlara dua etmək, onlardan yardım diləmək və onlara nəzr etmək şirkdir.Bu əməl, Uca Allahın qeyd olunan ayələrinə tamamilə zidd gəlir: *"Allahdan başqa heç kəsə dua etməyin!"*(əl-Cinn:18) *"Rəbbin yalnız Ona ibadət etməyi buyurmuşdur".*(əl-İsra:23) *"Ey insanlar! Rəbbinizə ibadət edin!"* (əl-Bəqərə:21) *"Rəbbiniz dedi: Mənə dua edin".* (Ğafir:60)

Əslində Uca Allaha yönəlmək, duanı xas Ona aid etmək və şəfaəti Ondan istəmək vacibdir.Çünki o, Allahın mülküdür və Uca Allah onu yalnız sözündən və əməlindən razı qaldığı şəxsə verir.Uca Allah buyurur: *"Onlar yalnız Onun razı qaldığı şəxslərdən ötrü şəfaət diləyir".*(əl-Ənbiya:28) Habelə Uca Allah buyurur: *"Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti Allahın istədiyi və Özünün razı qaldığı kimsələrdən başqa heç kəsə heç bir fayda verməz."*(ən-Nəcm:26) Habelə buyurur: *"Küfr etsəniz, bilin ki, Allah sizə möhtac deyildir.O, qullarının kafirlik etməsinə razı olmaz."*(əz-Zumər:7) Uca Allah qullarının küfr etməsinə razı olmur.Uca Allahın razı qaldığı tövhidin olması labüddür.Uca Allah buyurur: *"Həqiqətən, Allah yanında qəbul olunan din, İslamdır!"*(Ali İmran:19) *"İslamdan başqa bir din axtaran şəxsdən, o din heç vaxt qəbul olunmaz".*(Ali İmran:85) Allah tövhidə, İslama və Peyğəmbərə (salləllahu aleyhi və sələm) tabeçiliyə razı qalır.Din və İslam məhz budur.Bunu yerinə yetirəcəyin zaman Uca Allah Peyğəmbəri (salləllahu aleyhi və sələm) sənə və səninlə birgə tövhid əhlindən olan insanlara cənnətə girmək üçün şəfaətçi

edəcək.Habelə edəcəyin günahlar ucbatından cəhənnəmə girsən həmçinin şəfaət əhlindən olarsan.Təbii ki, tövhid və İslam üzərə ölmüş olsan.

Bir sözlə, Həmin şəxs sənə: İnkar edirsən?-deyərsə, ona deyəcəksən: Xeyir! İnkar etmirəm.Əksinə ona iman edir və iqrar edirəm.Lakin onu Sahibi olan Uca Allahdan istəmək gərəkdir.Uca Allah onu, şəfaət edənə izn verəndən sonra, habelə şəfaət edilənin əməlindən razı qalacağı zaman hər hansı bir şəxsə verəcək.*"Onlar yalnız Onun razı qaldığı şəxslərdən ötrü şəfaət diləyir".*(əl-Ənbiya:28) Uca Allah isə yalnız tövhiddən razı qalır və şirki qətiyyən bəyənmir.Uca Allah buyurur: *"Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz".*(ən-Nisa:48) Habelə buyurur: *"Şübhəsiz ki, Allaha şərik qoşmaq böyük zülmdür."*(Luqmən:13) Habelə buyurur: *"Küfr etsəniz, bilin ki, Allah sizə möhtac deyildir.O, qullarının kafirlik etməsinə razı olmaz."*(əz-Zumər:7) *"Onun izni olmadan Onun yanında kim şəfaət edə bilər."*(əl-Bəqərə:255) *"Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti Allahın istədiyi və Özünün razı qaldığı kimsələrdən başqa heç kəsə heç bir fayda verməz."*(ən-Nəcm:26) Qiyamət günü Arasat meydanında olan insanlar üçün şəfaət yalnız Allahın izni gələndən sonra hasil olacaq.Daha sonra Onun izni gələndən sonra cənnət əhli üçün şəfaət, sonra isə Onun izni gələndən sonra günahkarlar üçün şəfaət hasil olacaq.Sən Allaha dua et, ibadəti xalis Ona aid et və nəticədə şəfaət müjdəsini al! Şəfaət həm Peyğəmbərə (salləllahu aleyhi və səlləm) hə də, qeyrisinə verilmişdir.Ən əzəmətli şəfaət və cənnət əhlindən olan günahkarlar üçün şəfaət istisna olmaqla övliyalara və mələklərə həmçinin şəfaət verilmişdir.Ancaq sən: Mən onu mələklər və övliyalardan istəyirəm,-demirsən! Əgər bunu desən şirkə və şirk olduğunu öncə izah etdiyim salehlərə ibadət etməyə düşəcəksən.Əgər sən: Bunu

etmək olmaz,-desən, doğru söyləmiş olarsan.Çünki bu, həm peyğəmbərə həm də qeyrisinə aid olan doğru sözdür.

Şəfaət ancaq Allahdan istənilir.Sən yalnız səbəblərdən tutunur, Allahdan qorxur, Ona iman edir, Onu təkləşdirir, Ona şirk qoşmağı tərk edir və günahları tərk etməyə çalışırsan.Bununla birgə deyirsən: Allahım peyğəmbərini mənə şəfaətçi et! Allahım saleh qullarını mənə şəfaətçi et! Allahım erkən ölmüş uşaqları mənə şəfaətçi et! Bütün bu işlərlə birgə itaət edəcəyin və doğru səmtdə olacağın zaman özünü və əməlini bəyəndirməyə çalışma, arxayınlaşma, Allaha minnət qoyma və əməlinə vurğun olma! İfrata varmaqdan və əməlinə bel başlamaqdan, onu çox görməkdən və bəyənməkdən özünü qoru! Allahın sənin əməlini qəbul etməsi və sənə rəhm etməsi üçün daimə özünün taqsırkar olduğunu düşün! Uca Allah iman əhli barədə buyurur: *“Rəbbinə qayıdacaqlar deyə yerinə yetirməli olduqlarını qəlbləri qorxa-qorxa yerinə yetirənlər. Məhz onlar yaxşı işlər görməyə tələsər və bu işlərdə öndə gedərlər.”*(əl-Muminun:60-61) Aişə (r.a) demişdir: “Bu, zina edən, oğurluq edən və şərab içən şəxsdirmi? Peyğəmbər (salləllahu aleyhi və səlləm) dedi: Xeyir! Lakin bu, oruc tutan, namaz qılan, sədəqə verən və bunun ondan qəbul edilməyəcəyindən qorxan şəxsdir.”[16] Möminlər məhz bu cür olmuşlar.Onlar qorxu içində olub həzər etdikləri halda saleh işlər edirdilər. *“Həqiqətən, onlar yaxşı işlər görməyə tələsər, ümid və qorxu ilə Bizə yalvarardılar.Onlar Bizə müti qullar idilər.”*(əl-Ənbiya:90) Habelə buyurur: *“Həqiqətən, öz Rəbbindən Onu görmədikləri halda qorxanlar üçün bağışlanma və böyük bir mükafat vardır.”* (əl-Mulk:12) Habelə buyurur: *“Həqiqətən, Rəbbinin qorxusundan əsim-əsim əsənlər, Rəbbinin ayələrinə iman gətirənlər, Rəbbinə şərik qoşmayanlar, Rəbbinə qayı-*

---

[16] Tirmizi, bəbu va min surati əl-muminin:4198-ci hədis.

dacaqlar deyə yerinə yetirməli olduqlarını qəlbləri qorxa-qorxa yerinə yetirənlər."(əl-Muminun:57-60) Yəni, "qəlbləri qorxa-qorxa" əməllər edirlər.Onlar "Rəbbinə qayıdacaqlar".Yəni, onlar Allaha tərəf qayıdacaqlarına və Onunla qarşılaşacaqlarına dair imandan ötrü "yaxşı işlər görməyə tələsər və bu işlərdə öndə gedərlər."Bu, təqva əhlinin vəsfidir.Onların qəlbləri qorxu ilə dolduğu bir halda həzər edir, Allaha ixlaslı olur, Ona şərik qoşmur və saleh işlər edirlər.Onlar özlərini arxayın hiss etmir və təhlükədən uzaq olduqlarını düşünmürlər.Çünki insan təbiətcə taqsırkardır.İnsan etdiyi günahdan ötrü qorxur, işlətditi pislikdən tövbə etmədiyinə görə qorxur, şərtlərini tamamlamadığı əməldən ötrü qorxur.O, daimə həzər edir. Mömin bu cür olmalıdır. "Rəbbinə qayıdacaqlar deyə yerinə yetirməli olduqlarını qəlbləri qorxa-qorxa yerinə yetirənlər."(əl-Muminun:60) Onlar arxayın deyillər.Bəli, mömin İslam üzərə öləcəyi zaman xeyir üzərə olacağını bilir.Əgər biri tövhid üzərə ölərsə xeyir üzərə olar.Lakin insan daima günahlar şərinə düşmək təhlükəsindədir.

Mömin əməl edir, çalışır, səy göstərir və Rəbbinin ondan qəbul etməsinə ümid bəsləyir.O, Allahın və Peyğəmbərin xəbər verdiyi kimi tövhid əhlinin və möminlərin xilas olacaqlarına, kafirlərin isə həlaka düçar olacaqlarına, habelə şəfaətin yalnız Onun izni ilə hər hansı bir şəxsə veriləcəyinə iman edir.Allah şəfaəti yalnız sözündən və əməlindən razı qaldığı şəxslərə verəcək.Mömin, Allahın və Peyğəmbərin (səlləllahu aleyhi və səlləm) xəbər verdiyinə iman edir və bunun işığında Allahı və axirət diyarını istəyib səy göstərən, qorxan və qəlbi titrəyən şəxsin əməlini edir.Günahları və pis işlərindən dolayı qorxur.O, daima qorxur və pis işlərindən dolayı həzər edir.Möminlər Allahdan qorxur və Onu daimə göz önündə tuturlar. "Rəbbinin hüzurunda durmaqdan qorxanları iki cənnət bağı gözləyir." (ər-Rahmən: 46) "Bu, hüzurumda dur-

*maqdan qorxanlar və təhdidimdən çəkinənlərə aiddir."* (İbrahim:14) *"Onlar özlərinin fövqündə olan Rəbbindən qorxur və onlara əmr olunanları yerinə yetirilər."*(ən-Nəhl:50) Allahın övliyaları məhz bu cür olurlar.Onlar itaətdə və saleh işlərdə səylə çalışırlar.Onları daimə Allahın önündə böyük qorxu bürüyür. Onlar edəcəkləri pis işdən yaxud etinasız yanaşdıqları əməldən dolayı yaxalanacaqlarından qorxurlar.Bu, Allahın övliyalarının halıdır.Onlar səylə çalışır, fəallıqla əməllər edir, eyni zamanda qorxu və ehtiyat içində olurlar.Allah hamını müvəffəq etsin!

## Suallar:

**Sual: Bu hədis səhihdirmi: "Şəfaət edin ki, əcr qazanasınız!"[17]?**

**Cavab:** Bəli! Uca Allah buyurur: *"Kim yaxşı bir işə vasitəçilik etsə, ona bunun savabından bir pay düşər".*(ən-Nisə:85) Peyğəmbər (salləllahu aleyhi və səlləm) səhih hədisdə buyurur: "Şəfaət edin..." Hədis səhihdir.Hədisi Buxari və Muslim yaxud onlardan biri rəvayət etmişdir.Artıq Peyğəmbər Bərira adlı qadın üçün vasitəçilik etmişdir.Həmin qadın cariyə idi. Peyğəmbərin (salləllahu aleyhi və səlləm) təvəzökar olmasından ötrü həmin qadını Aişə (r.a) almış və azad etmişdir.Həmin qadının kölə olan bir əri var idi.Qadın seçim edib: Artıq onu istəmirəm,-demişdir.Həmin kölənin adı Muğis idi.O, həmin qadını çox sevir və ondan ötrü ağlayırdı.Peyğəmbər (salləllahu aleyhi və səlləm) həmin kişinin halını və qadına qarşı olan sevgisini gördüyü zaman qadının yanına gəlib dedi: Ey Bərira! Bəlkə onu qəbul edib və onunla qalmağa səbir

[17] Buxari, kitəbu-z-zəkət, bəbu-t-təhrid alə-s-sadəqati va-ş-şəfəati fihə:1432-ci hədis.Hədisi Əbu Musa əl-Əşari rəvayət etmişdir.Muslim, kitəbul birr va-s-sıləti val ədəb, bəbu istihbəbi-ş-şəfəati dimə lubbisə biharam:2627-ci hədis.

edəsən?! Qadın dedi: Xeyir ey Allahın Peyğəmbəri! Sən mənə əmr edirsən yoxsa vasitəçi durursan? Peyğəmbər (salləllahu aleyhi və sələm) dedi: Xeyir! Əmr etmirəm.Lakin vasitəçi dururam. Qadın dedi: Mənim ona ehtiyacım yoxdur."

Sual: Allahın şəfaət ediləndən razı qalması şəfaətin şərtlərindən deyilmi?

Cavab: Doğrudur.

Sual: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) öz əmisinə şəfaət etməsi və Allahın bunu qəbul etməsinin mənası nədir?

Cavab: Bu, xüsusi şəfaətdir.Ona şəfaət etmiş lakin bu şəfaət qəbul olunmamışdır.Uca Allah növbəti ayələri nazil etmişdir: *"Müşriklərin cəhənnəm sakinləri olduqları onlara bəlli olduqdan sonra, qohum olsalar belə, Peyğəmbərə və möminlərə onlar üçün bağışlanma diləmək yaraşmaz."*(ət-Təubə:113) Bunu bilməmişdən öncə olmuşdur.Bunun ardından isə şəfaəti tərk etmişdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) şəfaət etdiyi zaman demişdir: "Mənə yasaq edilməyincə sənin üçün bağışlanma diləyəcəm."[18] Ardından şəfaəti tərk etmişdir.Səhih Buxaridə məhz bu cür gəlmişdir.Bu ona yasaq edildiyi zaman isə şəfaət istəməyi buraxdı.

Sual: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) atası cənnətlikdir yoxsa cəhənnəmlik?

Cavab: Peyğəmbərin (salləllahu aleyhi və səlləm) valideyinləri cahiliyyat dönəmində yaşamış və cahiliyyat dini üzərə ölmüş-

[18] Buxari, kitəbul cənaiz, bəbu izə qaləl muşrik indəl məut lə iləhə illəllah:3884-cü hədis.Səid bin Museyyib rəvayət etmişdir.Muslim, kitəbul imən, bəbu-d-dəlil alə sihhəti isləmi mən hadarahul məut mə ləm yəşra` fi-n-nəz`i va huval ğarğara va nəsxi cəvəzil istiğfər lilmuşrikin:24-cü hədis.

lər.Hədisdə gəlmişdir: “Mənim və sənin atan atəşdədir.”[19] Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) anası üçün bağışlanma diləməyə izn istədi lakin ona izn verilmədi.Çünki o, cahiliyyat üzərə, bütlərə ibadət olan tayfasının dini üzərə ölmüşdür.

Sual: Məgər o, fətra əhlindən deyil?

Cavab: Hədisin zahiri onu göstərir ki, o, küfr əhlindən olmuşdur.Çünki Peyğəmbər (salləllahu aleyhi və səlləm) onun üçün bağışlanma istəməyə izn istədi lakin ona izn verilmədi.Habelə onun fətra əhlindən olması ehtimalı vardır.Lakin bəzi rəvayətlərdə gəlmişdir ki, o, cəhənnəm əhlindəndir.Bu hədis kimi: “Atam və atan atəşdədir.”[20] Muslim səhih kitabında rəvayət etmişdir.

Sual: Onlara öncəki dinlərin xəbərlərindən hər hansı bir şey çatmışdırmı?

Cavab: Güman olunur ki, onlara İbrahimin dinindən xəbərlər çatmış və bununla onların üzərindən hüccət qalxmışdır.

Sual: İbn Hişam “əs-sira”da qeyd etmişdir ki, Peyğəmbər (salləllahu aleyhi və səlləm) yola çıxdığı zaman anasının qəbiri üstünə gəlmişdir.Bu, rəvayət sabitdirmi?

Cavab: Bəli, sabitdir.Onu ziyarət etmiş və Rəbbindən onu ziyarət etmək üçün izn almışdır.Uca Allah onu ziyarət etməyə izn vermişdir.Bu isə, cahiliyyat əhlindən olan kafirin qəbrini ziyarət etməyin caiz olduğunu göstərir.Bağışlanma diləmək üçün deyil sadəcə ibrət almaq üçün ziyarət edilir.Uca Allah

---

[19] Muslim, kitəbul imən, bəbu bəyəni ənnə mən mətə aləl kufr fəhuva fi-n-nər:203-cü hədis.Hədisi Ənəs bin Malik (r.a) rəvayət etmişdir.
[20] Yuxarıda qeyd edilmişdir.

onu ziyarət etməyə izn vermiş lakin onun üçün bağışlanma diləməyə izn verməmişdir.

Sual: Qeyd olunur ki, onun anası İslamı qəbul etmişdir. Siz bu barədə nə deyə bilərsiniz?

Cavab: Bu, əsassız sözlərdir.Peyğəmbərin (salləllahu aleyhi və səlləm) atasının və anasının İslamı qəbul etdiklərini söyləmək, batil xəbərlərdir.

Sual: Valideyinlərin erkən ölmüş uşaqdan ötrü səbirsizlik etmələri onlara şəfaətin yetişməsinə maneədirmi?

Cavab: Xeyir! Erkən ölmüş uşaqlar şəfaət edəcəklər.Valideyinlər ondan ötrü ağı çəkəcəkləri yaxud yaxa cıracaqları yaxud üz vuracaqları zaman onlara tövbə etmək gərəkli olacaq. Onların tövbə etməsi və şəfaətə ümid bəsləməsi vacibdir.

Sual: Peyğəmbərə xas olan şəfaətlər hansılardır?

Cavab: Peyğəmbərə xas olan şəfaətlər üçdür.Arasat meydanında olan insanlara şəfaət etməsi.Bütün peyğəmbərlər bu şəfaətdən kənar qalacaqlar.Nuh, İbrahim, Musa və İsa.Habelə cənnət əhlinin cənnətə girməsi üçün edilən şəfaət.Cənnətin qapısını ilk açan məhz o olacaq.Habelə xas olaraq Əbu Talib üçün edilən şəfaət.Peyğəmbər (salləllahu aleyhi və səlləm) onun əzabının yüngülləşməsi üçün şəfaət edəcək.Allah qorusun! Bəli, Əbu Talib cəhənnəmin dərinliklərində ikən Peyğəmbər ona şəfaətçi olacaq və nəticədə o, atəşin ən dayaz yerinə qoyulacaq.Buna rəğmən onun beyini qaynayacaq.

Sual: Bu hədis səhihdirmi: "Şəhid ev əhlindən yetmiş nəfər üçün şəfaətçi ediləcək."[21]?

---

[21] Əbu Davud, bəbun fi-ş-şəhid yəşfəu:2522-ci hədis.Əbu Dərda rəvayət etmişdir. Tirmizi, bəbun fi səvabi-ş-şəhid:1663-cü hədis.İbn Macə, bəbu fədli-ş-şəhədə:2799-cu hədis.Əhməd:2/935.Şeyx Albani bu hədisi səhih saymışdır.

**Cavab: Allah bilir.**Hər halda hədisin isnadlarına nəzər yetirmək gərəkdir.

**Sual: Bu h**ədis səhihdirmi: "Quranı hifz etmək şəfaəti."[22]?

**Cavab: Allah bilir.**Hər halda hədisin isnadlarına nəzər yetirmək gərəkdir.

[22] Tirmizi, bəbu mə cəə fi fədli qari\` il quran:2905-ci hədis.İbn Macə, bəbu fədli mən təalləməl quran:216-cı hədis. İmam Əhməd:1/148.Şeyx Albani demişdir: Çox zəif hədisdir.

## Saleh insanlara dua etmək, onlardan yardım diləmək və onlardan şəfaət istəmək şirkdir

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) müşriklərin şəfaətini rədd etdiyi əsnada demişdir:

“Əgər həmin şəxs: Mən Allaha heç bir şeyi şərik qoşmuram.Qətiyyən! Lakin saleh insanlara pənah aparmaq şirk deyil,-deyərsə, ona söylə: Allahın şirki zinadan daha çox haram etdiyini iqrar edəcəyin, habelə Allahın onu bağışlamayacağını iqrar edəcəyin zaman, elə isə, Allahın əzəmətli etdiyi və bağışlamayacağını qeyd etdiyi həmin bu iş nədir? O, bunu bilmir.Belə olan halda ona de: Necə olur ki, sən şirkin nə olduğunu bilmədiyin halda özünün ondan uzaq olduğunu iddia edirsən yaxud necə olur ki, Allah sənə bunu haram edir və bunu bağışlamayacağını xəbər verir, sən isə bu barədə nə soruşur nə də, bir şey bilmirsən.Sən Allahın bizə onu haram etdiyini lakin onu bizə bəyan etmədiyinimi zənn edirsən? Əgər həmin insan: Şirk bütlərə ibadət etməkdir.Biz isə bütlərə ibadət etmirik,-deyərsə, söylə: Bütlərə ibadət etməyin mənası nədir?! Sən onların, o ağaclar və daşların yaradan, ruzi verən və onlara səslənən üçün işləri idarə edən olduğunu etiqad etdiklərinimi zənn edirsən? Qurani Kərim bunu təkzib edir. Uca Allah buyurur: “*De: Sizə göydən və yerdən ruzi verən kimdir?”.*(Yunus:31) Əgər həmin şəxs: Bunu qəbirin yaxud qeyrisinin üzərində olan ağaca və ya daşa və ya tikiliyə gəlib ona dua edən, qurban kəsən və onun onları Allaha yaxın etdiyini və bərəkəti vasitəsilə zərəri dəf edib və xeyiri cəlb etdiyini deyənlər edir,-deyərsə, söylə: Doğru söylədin. Bu, sizin qəbirlər və qeyrisi üzərində olan daşlar və tikililər yanında etdiyi-

niz əməldir.Bu adam onların etdiyi əməlin bütlərə ibadət olduğunu iqrar etmişdir.Tələb olunan da məhz budur.Habelə ona deyiləcək: Sən deyirsən ki, şirk, bütlərə ibadət etməkdir. Bunu deməklə sən şirkin bununla məhdud olduğunumu qəsd edirsən? Habelə saleh insanlara tapınmaq və onlara dua etmək buna daxil deyilmi? Bunu, Allahın Öz Kitabında mələklərə yaxud İsaya yaxud saleh insanlara tapınan şəxslərin küfrünə dair qeyd etdikləri rədd edir. Onun, salehlərdən hər hansı birini Allaha ibadətdə şərik qoşan şəxsin Quranda qeyd olunmuş müşrik olduğunu iqrar etməsi labüddür.Tələb olunan məhz budur.

Məsələnin sirri ondadır ki, həmin şəxs: Mən Allaha şərik qoşmuram,-deyəcəyi zaman sən ona deyəcəksən: Allaha şirk qoşmaq nədir, mənə izah elə? Əgər həmin adam: Şirk bütlərə ibadət etməkdir,-deyərsə, söylə: Bütlərə ibadət etməyin mənası nədir, mənə izah elə? Əgər o: Mən yalnız Bir olan Allaha ibadət edirəm.Ona söylə: Bir olan Allaha ibadət etməyin mənası nədir, mənə izah elə? Əgər həmin şəxs onu Quranın bəyan etdiyi kimi izah edərsə, tələb olunan hasil olar.Əgər o, bunu bilməzsə, elə isə necə olur ki, bilmədiyi bir şeyi iddia edir.Əgər bunu başqa mənada izah edərsə, sən ona Allaha şərik qoşmağın və Allahdan qeyrisinə ibadət etməyin mənasına dair, habelə bu dönəmdə etdikləri işin eynilə həmin əməl olduğuna dair, onların bizə inkar etdikləri işin Bir və şəriksin olan Allaha ibadət etmək olduğuna dair açıq-aydın ayələri bəyan edəcəksən.Habelə onların öz qardaşları tək səs-küylə etiraz etmələri bəlli olacaq: *"O, bütün məbudları bir məbudmu etdi? Həqiqətən, bu, əcaib bir şeydir."*(Sad:5)".

## Şərh:

Şeyxin (rahiməhullah) mələklərə və peyğəmbərlərə ibadət edən şəxslər üçün qeyd etdiyi bu sözlər, habelə mübahisə və münaqişə məzmunlu cümlələr açıq-aydındır.Bu açıq-aydın elmi münaqişədir.Elm tələbəsi bunu oxuyacağı zaman məsələ ona tam aydın olacaq.Sən onun önünə qaçılmaz bir gerçəyi qoyursan.Həmin insan: Mən Allaha şərik qoşmuram,-deyərsə, söylə: Allaha şərik qoşmağın mənası nədir? Allaha şirk qoşmaq nədir? Əgər adam: Allaha şərik qoşmaq, bütlərə ibadət etməkdir,-deyərsə, söylə: Bütlərə ibadət etməyin mənası nədir? Sən onların, həmin ağaclar, daşlar və tikililərin yaradan və ruzi verən olduğunu etiqad etdiklərinimi zənn edirsən? Əslində Qurani Kərim bunu təkzib edir.Onlar Allahın yaradan və ruzi verən olduğunu iqrar edirdilər.Uca Allah buyurur: *“De: Sizə göydən və yerdən ruzi verən kimdir? Qulaqlara və gözlərə hakim olan kimdir? Ölüdən diri çıxaran, diridən ölü çıxaran kimdir? İşləri yoluna qoyan kimdir? Onlar deyəcəklər: Allah! De: Bəs belə olduğu halda Allahdan qorxmursunuz?”.*(Yunus:31).Açıq-aydın məsələdir.Daha sonra ona bütlərə ibadət etməyin mənasını izah edir və bunun onlara tapınmaq, onlardan yardım diləmək, onlara nəzr etmək olduğunu bildirirsən.Onlar isə bunu saleh insanların qəbirləri yanında edir, habelə mələklərdən və cinlərdən onların tələblərini gerçəkləşdirmələrini istəyirlər.Əgər bunun ibadət olduğunu etiraf edərsə, tələb olunan hasil olacaq və onların övliyalara, salehlərə, cinlərə və mələklərə tapınmaqda öz əksini tapan yolun Allaha qoşulan şirk olduğu, habelə bunun onlara dua etmək, onlardan yardım istəmək, mədəd diləmək və bərəkət ummaq ilə olduğu bəlli olacaq.

Hər bir halda, sən onunla münaqişə etdiyin zaman bütün işlərdə ona güzəştə gedirsən.İnsan hər dəfə iddia ilə çıxış

etdiyi zaman sən ona güzəştə gedib: Bunu mənə izah et,- deyirsən.Əgər həmin adam: Mən Allaha şərik qoşmuram,- deyərsə, ona söylə: Allaha şərik qoşmağın mənası nədir? Bütlərə ibadət etmək nədir? Allaha ibadət etməyin mənası nədir? Bunu şəriətə müxalif tərzdə izah edəcəyi zaman ona deyirsən: Necə olur ki, sən bir şeyi bilmədiyin halda onu iddia edirsən?! Əgər onu şəriətə müvafiq tərzdə izah edərsə, ona deyəcəksən: Allaha həmd olsun! Tələb olunan məhz budur.Bu, şirkdir və sizin getdiyiniz yol məhz budur.Ölülərə və daşlara tapınmaq, onlardan yardım diləmək, onlara nəzr etmək, onlar üçün qurban kəsmək.Qureyş və digər müşriklərin yolu budur.Belə ki, müşriklərə haqq bəlli olduğu və Peyğəmbər (salləllahu aleyhi və səlləm) onları xəbərdar etdiyi zaman onlar bunu qəribə qarşılayıb demişlər: *"O, bütün məbudları bir məbudmu etdi? Həqiqətən, bu, əcaib bir şeydir."*(Sad:5) Habelə Uca Allah onlar barədə buyurur: *"Onlara: Allahdan başqa ibadətə layiq olan məbud yoxdur!-deyildikdə təkəbbür göstərir va deyirlər: Məgər bir məcnun şairə gör məbudlarımızı tərk edəcəyik? Xeyir! O, haqqı gətirdi və əvvəlki peyğəmbərləri təsdiqlədi."*(əs-Saffət:35-37) Onlar öz gerçək durumu, habelə şirk barədə cahildirlər.Həmin adamlar, onların yaradılış qayəsi olan ibadətdən qafildirlər.Belə ki, insanlardan biri onları haqqa çağırdığı zaman onlar cahil olduqları, haqqdan üz çevirdikləri və özlərindən öncəki azmış əcdadlarına təqlid etdikləri səbəbilə həmin çağırışı təəccüb və etirazla qarşılayırlar.

Lakin Uca Allah bir şəxsə hidayət vermək istədiyi zaman çağırış zamanı həmin insan düşünür, araşdırır və fikirləriş daha sonra haqqa müvəffəq olur.Məkkə və Mədinədə səhabələrin əhvalatlarında olduğu kimi Allahın hidayət vermək istədiyi şəxslər haqqı qəbul edirlər.Əbu Bəkr əs-Siddiq, uzun müddətdən sonra Ömər, Talha bin Ubeydullah, Zubeyr bin

Avvam və digər mühacirlər kimi Allahın hidayət vermək istədiyi şəxslər haqqı qəbul edirlər.Həmçinin Peyğəmbərin (salləllahu aleyhi və səlləm) yanına gəlmiş və Məkkəyə səfərə çıxmış ənsarlar.Peyğəmbər (salləllahu aleyhi və səlləm) onları öyrətmiş onlar isə öz növbəsində haqqı qəbul etmiş, onu anlamış və öz tayfalarına dəvətçi olaraq dönmüşlər.Onlar Peyğəmbərin (salləllahu aleyhi və səlləm) onlara hicrət etməsinə, dini onların içində yaymasına və onların arasında dəvət aparmasına dair Peyğəmbərə (salləllahu aleyhi və səlləm) beyət etmişlər.

Uca Allah onlar üçün hidayət istədiyi zaman onların bəsirət gözü açılmış və onlar haqqı qəbul etmişlər.Onlar batilə çağıran şəxslər olduqdan sonra haqqa çağıran insanlara dönmüşlər.Bu, Allahın lütfüdür, onu istədiyinə verir.Uca Allah buyurur: *"De: Bunlar Allahın lütfü və mərhəməti sayəsindədir! Qoy onlar buna sevinsinlər.Bu ki, onların yığdıqlarından daha xeyirlidir."*(Yunus:58)

Habelə sən, ey Allahın qulu! Daimə Rəbbinə yalvar və səni müvəffəq etməsini, sənin bəsirətin gözünü açmasını və gerçək işləri olduğu surətdə görməyin üçün qəlbində olan kiliti açmasını dilə! Habelə xeyir əhli ilə birlikdə olmağa və şərli insanlardan uzaq durmağa səy göstər! Çünki xeyir əhli ilə birlikdə olmağın sənə haqqa yetişməyə yardım edir və nöqsanlarını sənə göstərir.Şərli insanlarla birlikdə olmağın isə sənə haqqı görməyə mane olur və batilə, habelə öncəki əcdadların və böyüklərin adətləri üzərə kor-koranə getməyə sövq edir. Allah hamını müvəffəq etsin!

## Suallar:

**Sual**: Bəzi insanlar bir şeyi unutduğu yaxud bir şey istədiyi zaman "əl-Fatihə" surəsini oxuyur.Bunun hökmü nədir?

Cavab: Bu, bidətdir.Əksinə insanın Allahı zikr edib: Lə iləhə illəllah, Subhanəllah və bu kimi sözlər deməsi gərəkdir. Uca Allah buyurur: *"Unutduğun zaman Rəbbini zikr elə!"*.(əl-Kəhf:24)

Sual: Bəzi insanlar deyirlər: Mən sənin himayən altına girirəm.Bunun hökmü nədir?

Cavab: Bunu hər hansı bir şeydən qorxduğu səbəbilə deyərsə heç bir qəbahət olmaz.Çünki bəzən insan təhlükə altında olur.Peyğəmbər (salləllahu aleyhi və sælləm) Əbu Talibin ölümündən sonra Taifdən döndüyü zaman Mutim bin Adiyy adlı şəxsin himayəsinə girmişdir.Səni qoruya biləcək şəxsə: Filan ölkənin əhlindən yaxud filankəsdən yaxud onun oğullarından sənin himayən altına girirəm,-deməyin, inşallah qəbahətsiz işdir.

Sual: Filankəsin xatirinə səndən istəyirəm demək doğrudurmu?

Cavab: İnsanlardan istəniləcəyi zaman qəbahətsiz olacaq. Lakin Allahdan filankəsin xatirinə istəmək olmaz.Əgər bir şəxs: Atanın xatirinə yaxud atanın haqqı ilə səndən istəyirəm deyərsə, məsələn, Abdullah bin Cəfərin öz əmisi Əli bin Əbu Talibə dediyi kimi: Cəfərin haqqı ilə səndən istəyirəm[23], yəni qohumluq əlaqələrinin haqqı ilə istəyirəm,- deyərsə qəbahətsiz olar.Ancaq Allahdan bu tərzə bir şey istəmək olmaz.İnsan yalnız: Gözəl adlarınla yaxud Sənə olan imanımla yaxud Sənə olan sevgimlə Səndən istəyirəm,-deyə bilər.

Sual: Bəzi insanlar deyirlər: Hakimiyyə üluhiyyətin xüsusiyyətlərindəndir.

---

[23] Təbərani, əl-mucəmul kəbir:2/109, 1476-cı hədis.Abdullah bin Cəfər demişdir: Mən Əlidən (r.a) bir şeyi istədiyim və o, imtina etdiyi zaman mən: Cəfərin haqqı ilə istəyirəm,-deyərdim.Bunu dediyim zaman isə mənə istədiyimi verərdi.

Cavab: Xeyir! Onun xüsusiyyətlərindən şirkin tərk edilməsidir.Hakimiyyə, hakimin hökm verməsi vacib olan əhkamların şaxəli məsələlərini şamil edir.Hakimin şəriətlə hökm verməsi gərəkdir.Əgər o, qəsdən və halal sayaraq şəriətdən kənar hökm verərsə kafir olar.Əgər nəfsi istəyi və rüşvət səbəbilə hökm verərsə günah və pis iş görmüş olar və kiçik küfr işlətmiş olar.Bu, ibadət tövhidinə birləşik olan şər`i məsələlərdən biridir.

Sual: O, rübubiyyətə yoxsa üluhiyyətə daxildir?

Cavab: Fərqli olur.Bəzən küfrə daxil olur, bəzən isə günahlardan və kiçik küfrdən sayılır.Zina və şərab içmək mislindədir.Əgər onu halal sayarsa kafir olar.Əgər halal saymazsa günah olar.

Sual: İslam müfəkkirlərinə alim demək olarmı?

Cavab: Onların elmi olacağı zaman demək olar.

Sual: Məsələn şərqşunaslara demək olarmı?

Şeyx: Nəsraniləri qəsd edirsən?

Sual verən: Onlardan İslamı qəbul edənləri qəsd edirəm.

Cavab: Əgər Allah onları İslama hidayət edibsə və onların elmi varsa onlara sahib olduqları elm nisbətilə alim deyiləcək.Əgər onların elmi, yəni Quran və sunnə haqqında anlayışları varsa deyiləcək.

Sual: Allahın nazil etmədiyi ilə hökm vermək məsələsində etiqadın olması şərtdirmi?

Cavab: Bəli! Əgər nəfsi istəyi üzündən Allahın nazil etmədiyi ilə hökm verərsə kiçik küfr olar.

Sual: Yəni, hökmlərə müxalif olacağı zaman?

**Cavab: Məsələn halal saymayacağı zaman.Əgər insan özünün yanlış addım atdığını və zülm etdiyini bildiyi halda hakimiyyətdə qalmaqdan yaxud filankəsdən ötrü bunu edərsə küfr olmayan günah etmiş olacaq.**

**Sual: Dünyavi qanunlarla hökm verənin hökmü nədir?**

**Cavab: Onu halal saymayacağı sürəcə bu, kiçik küfr olacaq. Əgər onu halal sayarsa böyük küfr olacaq.Belə ki, zina həmçinin belədir.Əgər biri yüz qadınla zina etsə, onu halal saymayınca kafir olmaz.Habelə əgər yüz nəfəri öldürsə, onu halal saymayınca kafir olmaz.Doxsan doqquz nəfəri öldürüb daha sonra yüzü tamamlayan şəxsin əhvalatı buna misaldır. "İsrail oğullarından doxsan doqquz adam öldürmüş bir kişi var idi.Həmin adam bu haqda soruşmaq üçün yola çıxıb bir rahibin yanına gəlmişdir.Ona demişdir: Buna bir tövbə varmı? Rahib: Xeyir!-dediyi zaman onu həmçinin öldürmüşdür.Bir müddət sonra bu barədə sual vermək üçün yenidən yola çıxmışdır. Nəhayət bir kişi ona demişdir: Filan qəsəbəyə yollan! Yolda onu ölüm haqladı və həmin şəxs sinəsini getdiyi yerə tərəf çəkdi.Mərhəmət mələkləri və əzab mələkləri ona dair çəkişdirlər.Allah birinə yaxınlaş deyə, digərinə isə uzaqlaş deyə vəhy etdi.Sonra dedi: Bu ikisi arasında ölçün! Həmin şəxsin getdiyi yola bir qarış daha yaxın olduğu bəlli oldu və onun günahları bağışlandı."[24]**

**Sual: Allahın nazil etmədiyi hökmü halal sayan tağut sayılırmı?**

**Cavab: Bəli, halal saymasa belə Allahın nazil etmədiyi ilə hökm verəcəyi halda tağut adlanır.Əslində tağut, həm böyük tağut həm də, kiçik tağut olur.**

---

[24] **Buxari və Muslim rəvayət etmişlər.**

Sual: Bəzi adamlar deyirlər ki, Allahın nazil etmədiyi ilə hökm vermək zina və digər əhkamlardan ayələrin məzmunu ilə fərqlənir.

Cavab: Bilmirəm.Lakin səhabələrdən ibn Abbas və qeyriləri onun böyük küfr olmayan küfr olduğunu demişlər.Əgər bir şəxs qardaşı yaxud atası yaxud anası yaxud dostu üçün hökm verər yaxud haqqa müxalif olduğunu bildiyi halda hökmdə meyl edərsə kafir olacaqmı?

Sual: İbn Abbas "küfrdən aşağı küfr" sözünü deməklə nəyi qəsd edir?

Cavab: Yəni, halal saymadan Allahın nazil etmədiyi ilə hökm vermək qəsd olunur.

Sual: Oğurluq edib zina edərsə belə?

Cavab: Bəli!

Sual: Dünyavi məhkəmələrin qurulması və ona çağırış özlüyündə onu halal görməsinə dəlalət etmirmi?

Şeyx: Əgər insan zina edərsə: Onu halal gördüyü üçün etdi,- deyiləcəkmi?!

Sual verən: Xeyir!

Cavab: Elə isə, onu kafir edən amil nədir?! Məgər biri zina yaxud livat edərsə yaxud şərab içərsə biz ona: Kafir oldun!- deyəcəyik?!

## Sonraki müşriklərin şirki öncəki müşriklərin şirkindən daha böyükdür

Şeyxul-İslam Muhammməd bin Abdul-Vahhəb (rahiməhullah) müşriklərin şəfaətini rədd etdiyi əsnada demişdir:

"Əgər həmin şəxs: Onlar mələklərə və peyğəmbərlərə dua etməklə kafir olmurlar.Onlar yalnız mələklərin Allahın qızları olduqlarını dediklərinə görə kafir olurlar.Biz isə Abdul-Qadirin və qeyrisinin Allahın oğlu olduğunu demirik,-deyərsə, buna belə cavab veriləcək: Allaha övlad nisbət etmək müstəqil (ayrıca) bir küfrdür.Uca Allah buyurur: *"De: O Allah təkdir! Allah möhtac deyildir."*(əl-İxlas:1-2) Bir olan, tayı-bərabəri olmayandır.əs-Saməd adı isə, ehtiyaclar üçün qəsd ediləndir. Əgər biri, həmin surəni danmayacağı halda belə bunu danarsa kafir olar.Uca Allah buyurur: *"Allah Özünə heç bir övlad götürməmişdir.Habelə Onunla yanaşı ibadətə layiq olan heç bir məbud yoxdur."*(əl-Muminun:91) Uca Allah burada iki növü ayırmış və hər birini müstəqil küfr etmişdir.Uca Allah buyurur: *"Onlar cinləri Allaha şərik qoşdular.Halbuki onları da Allah yaratmışdır.Onlar Allah haqqında bir şey bilmədən Onun üçün özlərindən oğullar və qızlar uydurdular."*(əl-Ənam:100) İki küfrü ayırmışdır.Habelə saleh bir insan olması etibarı ilə Lata dua edən şəxslər onu Allahın oğlu etməmişlər.Buna rəğmən onlar kafir olmuşlar.Habelə cinlərə ibadət etməklə kafir olan insanlar onları Allahın övladları etməmişlər.Habelə bütün dörd məzhəbin alimləri mürtədin hökmünə dair bölümdə qeyd edirlər ki, müsəlman Allahın övlada sahib olduğunu deyəcəyi zaman mürtəd olur.Onlar iki növü ayırırlar.Bu, çox aydın məsələdir.Əgər həmin şəxs: "*Şübhəsiz ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar kədər içində*

*olmazlar.”*,- ayəsini deyərsə, söylə: Bu, doğrudur.Lakin onlara ibadət olunmaz. Biz yalnız Allah ilə yanaşı onlara ibadət etməyi və onları Allaha şərik qoşmağı qeyd etmişik.Ancaq onları sevmək, onlara tabe olmaq, onların kəramətini etiraf etmək sənə vacibdir.Övliyaların kəramətlərini isə yalnız bidət və zəlalət əhli inkar edirlər.

Allahın dini iki tərəfin arasında orta yol, iki zəlalətin arasında doğru səmt və iki batilin arasında bir haqqdır.Belə ki, zamanımızda olan müşriklərin “etiqad” adlandırdığı şeyin, Allahın Quranda nazil etdiyi və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) insanlara qarşı ondan ötrü vuruşduğu şirk olduğunu biləcəyin zaman bil ki, öncəki müşriklərin şirki zamanımızda olan müşriklərin şirkindən iki amilə görə daha yüngül olmuşdur:

Birinci: Öncəki müşriklər yalnız firavanlıq zamanı Allahı buraxıb mələklərə və övliyalara dua edirdilər.Lakin dara düşdükləri zaman dini xalis Allaha aid edərək Allaha dua edirdilər.Uca Allah buyurur: *“Sizə dənizdə bir fəlakət üz verdiyi zaman Ondan başqa tapındıqlarınız sizdən uzaqlaşar.O sizi quruya çıxartdıqda isə üz döndərirsiniz.Həqiqətən, insan nankordur!”.*(əl-İsra:67) Habelə buyurur: *“De: Doğru danışanlarsınızsa, deyin görüm, əgər sizə Allahın əzabı gəlsə və ya həmin saat sizi haqlayarsa, Allahdan başqasınımı çağıracaqsınız? Xeyir! Siz yalnız Onu çağıracaqsınız.Əgər Allah istəsə, Ona uzaqlaşdırması haqqında yalvardığınız bəlanı aradan qaldırar və şərik qoduğunuz şeyləri unudarsınız.”*(əl-Ənam:40-41) Habelə buyurur: *“De: Küfrünlə bu dünyada bir az dolan.Şübhəsiz ki, sən cəhənnəm sakinlərindənsən!”.*(əz-Zumər:8) Habelə buyurur: *“Dağların saldığı kölgələr kimi dalğalar onları çulğadığı zaman onlar dini məhz Allaha məxsus edərək Ona yalvararlar.”* (Luqmən:32)

Kim, Uca Allahın Öz Kitabında açıqladığı bu məsələni, yəni Peyğəmbərin savaş açdığı müşriklərin Uca Allaha və qeyrisinə firavanlıq zamanında dua etdiklərini, dara və çətinə düşdükləri zaman isə yalnız Allaha dua edib öz ağalarını unutduqlarını anlayarsa, ona zamanımızda olan müşriklərin şirki ilə önçəki müşriklərin şirki arasında fərq bəlli olacaq. Lakin haradadır qəlbi ilə bu məsələni doğru anlayan şəxslər? Vallahul mustəan!

İkinci: Öncəki müşriklər Allahla yanaşı Allah qatında qədir-qiyməti olan insanlara, peyğəmbərlərə yaxud övliyalara yaxud mələklərə dua edirdilər, habelə Allaha itatkar olub asi olmayan ağaclara və daşlara dua edirdilər.Zamanımızın müşrikləri isə Allahla yanaşı ən fasiq insanlara dua edirlər. Məhz onların dua etdikləri şəxslər onlara zina, oğurluq, namazın tərk edilməsi və başqa fahiş işlərə yol açırlar. Saleh şəxsə yaxud ağac və daş kimi asi olmayan məxluqa dair bu etiqadda olan şəxsin halı, fasiqliyi və pozğunluğu bəlli və məlum olan şəxsə dair etiqad edənin halından daha yüngüldür."

## <u>Şərh</u>:

Şeyx Muhammədin (rahiməhullah) bu izahından bəlli olur ki, öncəki müşriklərin etdiyi şirkin və sonraki müşriklərin etdiyi şirkin gerçəyinə dair açıqlamada Allahın hidayət vermək istədiyi şəxslər üçün çox aydın izah vardır.Öncəkilərin şirki firavanlıq zamanı hasil olmuşdur.Onlar peyğəmbərlərə, saleh insanlara, ağaclara, daşlara və mələklərə ibadət edirdilər.Ancaq dara düşdükləri zaman Uca Allahın Qurani Kərimdə bəyan etdiyi kimi ibadəti xalis Allaha yönəldirdilər. Uca

Allah buyurur: *“Onlar gəmiyə mindikləri zaman, dini yalnız Allaha məxsus edərək, Ona yalvarırlar.Allah onları xilas edib quruya çıxaran kimi, yenə də Ona şərik qoşurlar.”*(əl-Ənkəbut:65) Habelə buyurur: *“Dağların saldığı kölgələr kimi dalğalar onları çulğadığı zaman onlar dini məhz Allaha məxsus edərək Ona yalvararlar.Allah onları xilas edib quruya çıxartdıqda isə aralarında bəziləri küfrlə iman arasında orta yol tutar.Bizim ayələrimizi yalnız nankor xainlər inkar edərlər.”*(Luqmən:32) Habelə buyurur: *“Sizə dənizdə bir fəlakət üz verdiyi zaman Ondan başqa tapındıqlarınız sizdən uzaqlaşar.”*(əl-İsra:67) Bu, onların dara düşdükdə olan durumudur.Onlar bu halda ibadəti xalis Allaha aid edirdilər. Belə ki, onlar dənizdə olarkən dalğalar qalxdığı və onlar fəlakətlə üz-üzə qaldıqları zaman ibadəti xalis Allaha aid edirdilər.Lakin rahatlıq və əmin-amanlıq gəldiyi zaman Allaha şərik qoşmağa başlayırdılar. Ancaq sonraki müşriklərin şirki həm firavanlıq zamanı həm də, sıxıntı vaxtında daimi olmuşdur. Üstəlik onların şirki dara düşdükləri zaman daha qabarıq üzə çıxır.Bu cür halda onlar səslənib: Ey Abdul-Qadir! Ey şeyx Əhməd Bədəvi!-deyirlər. Yəni öncəki müşriklərdən fərqli olaraq sıxıntı zamanı bunu edirlər.

Əgər onlar: Biz onlara ibadət etmirik və onlara Allahın qızları demirik.Öncəki müşriklər onların Allahın qızları olduqlarını dedikləri səbəbilə şirkə düşmüşlər.Biz isə onların Allahın qızları olduqlarını demirik.Onların şirki dua ilə deyil və sadəcə Ona qızlar nisbət edib: Bunlar Allahın qızları yaxud Allahın övladlarıdır,-demələri səbəbilədir,-desələr, onlara söylə: Xeyir! Onlar bunu demiş və həm bununla həm də digər amil səbəbilə kafir olmuşlar.Həm bu həm də digəri özlüyündə müstəqil küfrdür.Əgər biri Allaha övlad nisbət edərsə bu, müstəqil küfr olacaq.Onlara dua etmək və onlardan yardım istəmək həmçinin müstəqil küfrdür.Müşriklər həm

bunu həm də digər küfrü özlərində cəm etmişlər.Sən onları Allahla yanaşı çağırıb onlardan yardım istəyəcəyin zaman şirkə düşmüş olacaqsan.Sən: Mələklər Allahın qızlarıdır, Uzeyir Allahın oğludur, Məsih Allahın oğludur,- deməsən belə bunu edəcəyin zaman şirkə düşəcəksən.Sənin ibadəti Allahdan qeyrisinə yönəldib ondan yardım istəməyin və ona nəzr etməyin şirkdir. Uca Allah buyurur: *“Allahdan başqa heç kəsə dua etməyin!”.*(Cinn:18) Habelə buyurur: *“Allahı qoyub qiyamət gününədək özünə cavab verə bilməyənə yalvaran kimsədən daha çox azmış kim ola bilər? Halbuki onlar, onların yalvarışından xəbərsizdirlər.İnsanlar bir yerə toplanacaqları zaman onlara duşmən kəsiləcək və onların ibadətini inkar edəcəklər.”*(əl-Əhqaf:5-6) Onların duasını ibadət adlandırmışdır. Habelə buyurur: *“Bu sizin Rəbbiniz olan Allahdır.Mülk Onundur.Sizin Ondan başqa yalvardıqlarınız xurma çəyirdəyinin pərdəsinə belə sahib deyillər.Əgər siz onları çağırsanız, onlar sizin duanızı eşitməzlər, eşitsələr də cavab verə bilməzlər. Özləri də qiyamət günü sizin şirkinizi danacaqlar.Heç kəs hər şeydən Xəbərdar olan Allah kimi sənə xəbər verə bilməz.”* (Fatir:13-14) Onların duasını şirk adlandırmışdır.Habelə buyurur: *“Kim Allahla yanaşı, haqqında özünün heç bir dəlili olmadığı başqa bir ilaha ibadət edərsə, onun cəzasını Rəbbi Özü verəcəkdir.Şübhəsiz ki, kafirlər nicat tapmazlar.”*(əl-Muminun:117) Onları mələklərə, peyğəmbərlərə və saleh insanlara dua etdiklərinə görə kafir adlandırmışdır.Onlar ibadət etdikləri məbudların Allahın qızları olduğunu deməsələr belə kafir olacaqlar.Allaha övlad nisbət etmək müstəqil küfrdür. Mələklərə yaxud ölülərə yaxud övliyalara dua etmək həmçinin müstəqil küfrdür.Dini söymək müstəqil küfrdür. Zina və bu kimi Allahın haram etdiyi işləri halal saymaq müstəqil küfrdür.Allahın vacib buyurduğunu qüvvədən salmaq müstəqil küfrdür.Məsələn bir insanın: Namaz vacib de-

yil yaxud imkan olduğu halda həcc vacib deyil yaxud zəkat vacib deyil,-deməsi müstəqil küfrdür.

Əgər həmin adam sənə: *"Şübhəsiz ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar kədər içində olmazlar."* (Yunus:62) Mələklər isə Allahın dostlarıdır.Səhabələr Allahın dostlarıdır.Habelə Lat Allahın dostlarından biridir,-deyərsə, söylə: Bəli! "*Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar kədər içində olmazlar."* Buna səbəb, onların saleh əməl-ləridir.Lakin bu, onlara dua etməyi ifadə etmir.Məhz saleh əməlləri səbəbilə onlara qorxu yoxdur və onlar kədər içində olmazlar.Lakin sənin Allahla yanaşı onlara dua etməyin, onlardan yardım istəməyin, onlardan ehtiyacların ödənməsi və kədərin sovrulmasını istəməyin yolverilməzdir.Əməlləri və kəramətləri onlara aiddir.Lakin sənin onlara dua edib onları Allaha şərik qoşmağın yolverilməzdir.Onları Allah üçün sevmək və xeyir işlərdə onları örnək tutmaq gərəkdir. Allah-dan başqa onlara dua etmək isə olmaz.Habelə sənin peyğəmbərlərə və saleh insanlara dua etməyin yolverilməzdir. Onların övliya olmaları doğrudur lakin bu Allahla yanaşı onlara dua etməyi ifadə etmir.Habelə peyğəmbərlər və elçilər həqiqətdir.Lakin onlara Allahla yanaşı dua olunmur və onlar-dan yardım istənilmir.

Bununla da, həmin şübhələrin batilliyi və müşriklərin dərin bir zəlalətdə olduqları və haqqı görməyə qadir olma-dıqları bəlli olur.Uca Allah buyurur: *"Onlar kar, lal və kor olduqlarına görə doğru yola qayıtmazlar."*(əl-Bəqərə:18) Habelə buyurur: *"Yoxsa elə hesab edirsən ki, onların əksəriyyəti eşidəcək və ya anlayacaq? Onlar heyvan kimidirlər, hətta, haqq yoldan daha çox uzaqlaşmışlar."*(əl-Furqan:44) Habelə buyurur: *"Allah onların qəlblərini və qulaqlarını möhürləmiş, gözlərinə də pərdə çəkmişdir."*(əl-Bəqərə:7) Allahın bəyan etməsinə rəğmən

onlar doğru yoldan azmış və haqqı anlamamışlar. Uca Allah buyurur: *"Alah bir qövmü doğru yola yönəltdikdən sonra uzaqlaşmaları zəruri olan şeylərdən onları xəbərdar etməyincə onları həmin yoldan azdırmaz."*(ət-Təubə:115) O, müjdələyən və qorxudan elçilər göndərmiş və kitablar nazil etmişdir.Lakin onlar nassları anlamaqdan, ona sarılmaqdan və haqqı qəbul edib ondan faydalanmaqdan üz çevirir və uzaq dururlar. Onlar sadəcə qulaqlarını tıxayaraq nəfsi istəklərinə uyur və əcdadlarına təqlid edirlər.Allah qorusun!

## Suallar:

**Sual:** Əgər biri: Əhli sunnə ilə rafizilər arasında olan ixtilaf yalnız şaxəli (furu`) məsələləri şamil edir,-deyərsə, onun hökmü nədir?

Cavab: Xeyir! İxtilaf əqidədə baş vermişdir.Onlar əhli beytin fayda və zərər verdiklərini etiqad edir və Allahla yanaşı onlara dua edir, onlardan yardım istəyir və nəzr edirlər. Eyni-lə Qureyş kafirlərinin Lat, Uzza, habelə peyğəmbərlər və saleh insanlarla etdikləri kimi müşriklərin etdiyini edirlər.

**Sual:** Lakin bu insan həmin sözləri deyir.Onun hökmü nədir?

Cavab: Bu, onların əqidəsindən bixəbər cahilin birisidir. Beləsinə onların əqidəsi izah edilib anlatılmalıdır.Bu, onların əqidəsidir.Onlar əhli beytə qarşı ifrata varırlar.Əlaxsus Əli, Həsən, Hüseyn, Fatimə və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qızları.Bəziləri isə xüsusi olaraq Həsən və Hüseynə qarşı ifrata varırlar.Çünki onların fayda verdiyi iddiası ilə onlardan yardım diləyir və onları, Allahın əzabından xilas etmələrini istəyirlər.Bəziləri isə Əlinin peyğəmbər olduğunu və Cəbrayılın risalətə xəyanət etdiyini etiqad edir və Cəbrayılı

“mixvan: böyük xəyanətkar” adlandırırlar.Bəziləri isə ona qarşı ifrata varır və ona dua edildiyi zaman onun fayda verdiyini, yardım istənildiyi zaman yardım etdiyini və onların qəm-qüssəsini apardığını etiqad edirlər.Biz: Ya Allah!-dediyimiz kimi onlar: Ya Əli! Ya Həsən! Ya Hüseyn! Ya Fatimə!-deyə səslənirlər.

Sual: Satışda və kitabxanalarda olan bəzi kitablarda, (Allahın sifətlərinə dair) mənanı və keyfiyyəti Allaha həvalə etmək sələfin məzhəbi olduğu vurğulanır.

Cavab: Xeyir! Bu doğru deyil.Yalnız keyfiyyətin həvalə edilməsi sələfin məzhəbidir.Sələfin mənaları “təfvid” Allaha həvalə etdiyini deyən şəxs yanlış fikirdədir.Sələfin məzhəbi yalnız keyfiyyəti həvalə etməkdir.Belə ki, biz ər-Rahmən adının, ər-Rahim adının, əs-Səmi` adının, əl-Bəsır adının, əl-Əziz və əl-Hakim adlarının mənalarını bilirik.Lakin keyfiyyətini bilmirik.Onun mərhəmətinin, isteva etməsinin və elminin necəliyini bilmirik.Biz bunun keyfiyyətini bilmirik.

Sual: Bu, “mufavvida” adlı firqənin məzhəbidirmi?

Cavab: Bəli! Bu, “mufavvida” məzhəbi adlanır.Heç şübhəsiz ki, o, batil məzhəbdir.

Sual: Şiələrin, sufilərin və qeyrilərinin avam insanlarına müəyyən olaraq küfr adı şamil oluna bilərmi?

Cavab: Onlar öz başçıları və başbilənlərinin izlərinə düşürlər. Əgər onlar həmin başbilənlərin etiqad etdiyini etiqad edərlərsə onlar mislində olacaqlar.

Sual: Bəzi insanlar rafizilərin məzhəbindən bixəbər olduqları səbəbilə onları müdafiə edirlər.Ona nəsihət olunduğu zaman isə: Sən təəssübkeşsən!-deyir.

Cavab: Belə insanlara onların əqidəsi, habelə nəsihətin təəs-sübkeşlik olmadığı izah edilməlidir.Bu insan, sanki ibn Əbu Rabiəni müdafiə edir.Bu adama onların əqidələri izah edilməli və onların Əli və əhli beytə qarşı ifrata varıb onlardan mədəd diləmələri bəyan edilməlidir.Bu, onların əqidəsidir. Qureyş kafirləri, dua etmək və yardım diləmək kimi ibadəti Lat, Uzza, Mənat, Hubəl və digər bütlərə yönəltdikləri kimi onlarda ibadəti Allahdan qeyrisinə yönəldirlər.

Sual: Bir ticarətçinin rafizi olduğu bilinəcəyi və onun satdığı malın insanlar arasında məşhur olacağı zaman insanlar onunla alış-veriş etməsinlər deyə ondan çəkindirmək lazım-dırmı?

Cavab: Bu, mübahisəli məsələdir.Belə ki, kafirlərlə alış-veriş etmək caizdir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) öz yaxınları üçün yəhudidən yemək almışdı.Lakin inanlar onu dost, yoldaş və yaxın tutmasınlar deyə onlara bildirilir.Ehtiyac olarsa onunla alış-veriş etmək olar.Lakin onun kəsdiyi ət və yeməklər yeyilməz və onunla dostluq edilməz.Onları sevmək və dost bilməkdən çəkinmək və bu işdə onlarla səhlənkar olmamaq lazımdır.Onların küfrü və zəlaləti, habelə çirkin əməlləri, onların ümumi şəkildə səhabələri, xüsusi olaraq Əbu Bəkri və Öməri söyməleri, əhli beytdən və Əlidən mədəd və yardım diləmələri insanlara bəyan edilməlidir.Bu, böyük şirkdir.Səhabələri söymək isə müstəqil küfrdür.Çünki bunun mənası onların xain olduqlarını deməkdir.

Sual: Əgər bir rafiziyə bir əmələ dair nəsihət olunarsa o isə qəbul etməyib: Məni bu işlər maraqlandırmır,-deyərsə, ardından namazın vaxtı gəldiyi zaman namaz qılmazsa. Beləsinə namazı əmr etmək lazımdır yoxsa onu buraxıb kafir müamiləsi aparmaq lazımdır?

Cavab:Xeyir! Namazı əmr etmək lazımdır.Çünki o, özünün müsəlman olduğunu iddia edir.Allah üçün ona nifrət etmək, ona ədavət bəsləmək,eyni zamanda namazı əmr edib: Namazı qıl!-demək gərəkdir.

Sual: Dini söyənin hökmü nədir?

Cavab: Dini söymək küfrdür.Peyğəmbəri söymək küfrdür. Dini, Allahı və bütün səhabələri söymək küfrdür.

## Lə iləhə illəllah və Muhammədun rasulullah sözünü iqrar etmək və bəzi əmrlərə boyun əymək qəbirə tapınanlardan şirki dəf etmir

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) müşriklərin şübhələrini rədd etdiyi əsnada demişdir:

"Peyğəmbərin (salləllahu aleyhi və səlləm) savaşdığı adamların bunlardan daha sağlam ağıla və daha yüngül şirkə sahib olduqlarına əmin olacağın zaman bil ki, bunların bizim qeyd etdiyimiz sözlərə gətirdikləri şübhələri vardır.O, onların ən böyük şübhəsidir.Belə ki, onun cavabını diqqətlə dinlə! Onlar deyirlər: Barələrində Quran nazil olan şəxslər "lə iləhə illəllah" şəhadətini gətirmirdilər, habelə Peyğəmbəri (salləllahu aleyhi və səlləm) təkzib edir və qiyamət gününü inkar edirdilər. Onlar Quranı təkzib edir və onun sehr olduğunu hesab edirdilər.Biz isə "lə iləhə illəllah, Muhammədun rasulullah" şəhadətini gətirir, Quranı təsdiq edir, qiyamət gününə iman edir və namaz qılıb oruc tuturuq.Necə olur ki, siz bizi onlar mislində edirsiniz?

Cavab: Bütün alimlər arasında fikiryarılığı yoxdur ki, insan Peyğəmbəri (salləllahu aleyhi və səlləm) bir şeydə təsdiq edib digər bir şeydə təkzib edəcəyi zaman kafir olacaq və İslam dininə daxil olmayacaq. Habelə Quranın bir qisminə iman edib digər qismini danacağı zaman həmçinin kafir olacaq.Misal olaraq, tövhidi iqrar edib namazın vacibliyini danmaq yaxud tövhidi və namazı iqrar edib zəkatın vacibliyini danmaq yaxud bütün bu işləri iqrar edib orucu danmaq yaxud bütün bunları iqrar edib həcci danmaq.Belə ki, Peyğəmbərin (salləlla-

hu aleyhi və səlləm) dönəmində bəzi insanlar həcc əmrinə boyun əymədikləri zaman Uca Allah onlar haqqında növbəti ayəni nazil etmişdir: *“Evi (Kəbəni) ziyarət etmək insanların-yoluna gücü çatan hər kəsin-Allah qarşısında borcudur.Kim bunu inkar edərsə, bilsin ki, Allahın aləmlərə ehtiyacı yoxdur.”*(Ali İmran:97) Habelə bütün bu işləri iqrar edib qiyamət gününü inkar edərsə icma ilə kafir olacaq və onun qanı və malının toxunulmazlığı gedəcək.Uca Allah buyurur: *“Allahı və Onun elçilərini inkar edənlər, Allahı Onun elçilərindən ayırmaq istəyib: Biz o elçilərin bəzisinə inanır, bəzilərinə isə inanmırıq!-deyənlər və bunun arasında bir yol tutmaq istəyənlər-məhz onlar əsl kafirlərdir.Biz kafirlər üçün alçaldıcı bir əzab hazırlamışıq.”*(ən-Nisə:150-151) Uca Allahın Quranda, Kitabın bir qisminə iman edib digər qisminə küfr edən şəxsin həqiqi kafir və qeyd olunan cəzaya layiq olduğunu açıq bildirdiyi bəlli olacağı zaman bu şübhə aradan qalxacaq.Bu, əl-Əhsə əhlindən olan bəziləri tərəfindən bizə göndərilən məktubda qeyd olunur.

Həmçinin deyiləcək: Belə ki, sən Peyğəmbəri hər bir şeydə təsdiq edib namazın vacibliyini danan şəxsin icma ilə qanı halal kafir olduğunu iqrar edirsən.Həmçinin insan qiyamət günündən başqa hər bir şeyi iqrar edərsə, habelə yalnız Ramazan orucunun vacibliyini danıb bütün bu işləri təsdiq edərsə, məzhəblər belə şəxsə dair ixtilaf etmirlər.Habelə qeyd edildiyi kimi Quranda bu açıq bildirilir.Məlum olduğu kimi tövhid, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi ən əzəmətli fərzdir. O, namazdan, zəkatdan, orucdan və həccdən daha əzəmətlidir. Necə olur ki, insan Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi bütün şeylərə əməl edəcəyi halda bu işlərdən birini danacağı zaman kafir olur, ancaq bütün peyğəmbərlərin dini olan tövhidi danacağı zaman kafir olmur?! Subhanəllah, bu necə cahillikdir!

Habelə deyiləcək: Budur, Peyğəmbərin (salləlahu aleyhi və səlləm) səhabələri Peyğəmbərin dönəmində İslamı qəbul etmiş Bənu Hanifə qəbiləsinə qarşı vuruşmuşlar.Həmin insanlar isə "lə iləhə illəllah, Muhammədun rasulullah" şəhadətini dilə gətirir, namaz qılır və əzan verirdilər.Əgər həmin şəxs: Lakin onlar Museylimənin peyğəmbər olduğunu deyirdilər,-deyərsə, biz deyəcəyik: Tələb olunan məhz budur.Belə ki, əgər bir şəxsi Peyğəmbərin (salləllahu aleyhi və səlləm) rütbəsinə qaldıran şəxs malı və qanı halal olan və nə şəhadətdən nə də ki, namazdan fayda görməyən kafir olursa, elə isə Şəmsəni yaxud Yusufu yaxud səhabəni yaxud peyğəmbəri göylərin və yerin Hökmdarının rütbəsinə qaldıran şəxsin halı necə olsun?! Pak və müqəddəs Allahın şəni necədə ucadır: "*Allah haqqı bilməyənlərin qəlbini belə möhürləyir.*"(ər-Rum:59)".

## Şərh:

Şeyximiz (rahiməhullah) qəbirlərə və övliyalara sitayiş edən həmin müşriklərin, onları təkfir edən və onların qanı və malını halal sayan, habelə onların Allahdan qeyrisinə ibadətlərini, qəbirlərə və övliyalara üz tutub onlara dua etmələrini inkar edən şəxslərə qarşı şübhə gətirirdiklərini qeyd edir. Onlar deyirlər: Biz "lə iləhə illəllah, Muhammədun rasulullah" şəhadətini qətirdiyimiz, namaz qılıb oruc tutduğumuz və qiyamət gününə iman etdiyimiz bir halda siz bizi Qureyş kafirləri və qeyriləri ilə tay tutdunuz və bizim qanımızı və malımızı halal saydınız.Necə bizi onlarla bərabər edirsiniz?

Onların şübhələri bir çox insanlara gizli qalır.Onlara deyiləcək: Bəli! Siz "lə iləhə illəllah, Muhammədun rasulullah"

şəhadətini gətirirsiniz.Lakin şəriətin dəlalət etdiyi dəlillərə əsasən, əgər biri Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi hər hansı bir şeyi danarsa, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) gətirdiyi bütün digər şeyləri edəcəyi halda belə kafir olacaq. Belə ki, insan tövhidi iqrar edib namazın vacibliyini danacağı zaman kafir olmayacaqmı? O, deyəcək: Kafir olacaq.İnsan, namaz qılıb zəkat verərsə belə zəkatın yaxud Ramazan orucunun yaxud imkan olacağı halda həccin vacibliyini danacağı yaxud qiyamət gününə və dirilişə inanmayacağı zaman kafir olacaq.Əgər sizə bu məsələ və bu işlərdən birini danaraq tərk edənin küfrü bəllidirsə, elə isə şəhadəti danıb onun mənasına zidd gələn və Allah ilə yanaşı qeyrisinə ibadət edən şəxs necə olsun?! Museyliməni Muhamməd (salləllahu aleyhi və səlləm) kimi peyğəmbər edənlərin və nəticədə səhabələr tərəfindən savaşa məruz qalanların bütün müsəlmanlara görə kafir olduqları bir halda, bir insanı Uca Rəbbin rütbəsinə qaldıran şəxsin halı necə olsun?! Muhamməd (salləllahu aleyhi və səlləm) sonuncu peyğəmbər olduğu halda digər bir şəxsi peyğəmbər etməsi səbəbilə onu peyğəmbərlikdən üstün rütbəyə qaldıran şəxs kafir olursa, elə isə Şəmsən yaxud Yusuf yaxud ibn Ulvan yaxud başqası kimi bir şəxsi Allah səviyyəsinə qaldırıb ondan yardım diləyən, ona nəzr edən, ona qurbanlar gətirən şəxs necə olsun?! Beləsi Museyliməni Peyğəmbərin (salləllahu aleyhi və səlləm) səviyyəsinə qaldıran şəxsdən kafir olmağa daha layiq deyilmi?!

Habelə əgər biri mələklərə yaxud cinlərə ibadət edib onlardan yardım diləyərsə, onları Allah səviyyəsinə qaldırmış olar və Allah ilə yanaşı onlara ibadət etmiş olar.Həmin şəxs namaz qılıb oruc tutarsa və həcc edərsə, habelə bütün buyuruqları yerinə yetirərsə belə kafir olacaq.Belə ki, əgər bir şəxs namaz qılar, oruc tutar və bütün buyuruqları edərsə lakin Muhammədin (salləllahu aleyhi və səlləm) peyğəmbərliyini yaxud

onun sonuncu peyğəmbər olduğunu inkar edərsə kafir olar və iqrar etdiyi həmin ibadətlər ona heç bir fayda verməz. Bununla aydın olur ki, əgər biri şəriətin buyurduğu bütün işləri edər və onu iqrar edərsə lakin İslamı pozan hər hansı bir amil işlədərsə bütün qeyd olunan işlər puça çıxar.İnsan İslamı pozan bir amil edəcəyi zaman, namazın vacibliyini, zəkatın vacibliyini, Ramazan orucunun vacibliyini, həccin vacibliyini, qiyamət və dirilişi, Muhammədin sonuncu peyğəmbər olduğunu danacağı zaman bütün insanlara görə kafir olacaq.İnsan tövhidi danıb onu iqrar etməyəcəyi və Allaha ibadətdə qeyrisini şərik qoşacağı zaman isə o, kafir olmağa daha layiq olacaq.Beləsinə iqrar etdiyi və yerinə yetirdiyi ibadətlər fayda verməyəcək.Belə ki, səhabələr Bənu Hənifə qəbiləsinə qarşı vuruşmuşlar.Onlar isə namaz qılır, oruc tutur, "lə iləhə illəllah və Muhammədun rasulullah" şəhadətini gətirirdirlər.Lakin onlar Museylimənin peyğəmbər olduğunu təsdiq etdikləri zaman kafir olmuşlar.Həmçinin Tuleyhə əl-Əsədinin peyğəmbər olduğunu təsdiq edən şəxslər kafir olmuşlar.Habelə əl-Əsvəd əl-Ansi Yəməndə yaxud Muxtar bin Əbu Ubeyd əs-Səqafi peyğəmbərlik iddia etdikləri zaman kafir olmuşlar və müsəlmanlar onlara qarşı savaşmışlar.Bununla da məlum olur ki, əgər bir şəxs İslamı pozan amillərdən birini edərsə onun bütün əməlləri puça çıxacaq.Uca Allah buyurur: *"Allahı və Onun elçilərini inkar edənlər, Allahı Onun elçilərindən ayırmaq istəyib: Biz o elçilərin bəzisinə inanır, bəzilərinə isə inanmırıq!-deyənlər və bunun arasında bir yol tutmaq istəyənlər-məhz onlar əsl kafirlərdir."*(Nisə:150-151) Onlar Allahı Onun elçilərindən ayırdıqları zaman Allah onların əsl kafir olduqlarını xəbər vermişdir.Çünki onlar Kitabın bir qimsinə iman edib digər qisminə küfr etmişlər.Onlar demişlər: Məsələn, biz Muhammədə (salləllahu aleyhi və sələm) iman edir lakin qiyamət

gününə və insanların diriləcəyinə inanmırıq yaxud zəkatın vacib olduğuna inanmırıq yaxud Ramazan orucunun vacibliyinə inanmırıq.Bütün bu işlər insanı İslamdan çıxarıb kafirə çevirir.İnsan bundan savayı İslamın bütün buyuruqlarını edəcəyi zaman İslamı pozan bir amil onun bütün əməllərinin batil olub puça çıxması üçün kifayət edir.Hamçinin əgər onlar hər bir şeyi iqrar edib Allahı yaxud Peyğəmbəri söysələr yaxud dinə tənə etsələr yaxud dinə istehza etsələr kafir olacaqlar və İslamı pozan amilə düşdükləri zaman yerinə yetirdikləri ibadətlər onlara heç bir fayda vermyəcək.Ayə məhz buna dəlalət edir: *"Allahı Onun elçilərindən ayırmaq istəyib: Biz o elçilərin bəzisinə inanır, bəzilərinə isə inanmırıq!- deyənlər".*(ən-Nisə:150) Onlar bir qisminə iman edib digər qisminə küfr etdikləri zaman əməlləri puça çıxmış kafirlərə dönmüşlər.Buna bənzər ayələrdən birində Uca Allah buyurur: *"De: Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz? (Əbəs yerə) üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz."*(Təubə:65-66) Onlar, namaz qılıb oruc tutsalar belə istehza etməklə kafir olmuşlar.Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Dinini dəyişəni öldürün!".[25] Dini dəyişmək İslamı pozan amili etməklə hasil olur.Dini dəyişmək budur.Bu səbəbdən, bütün məzhəb alimləri kitablarında "mürtədin hökmünə dair fəsil" adlı başlıq açıb demişlər: O, İslama girəndən sonra kafir olan müsəlmandır.Yəni, İslamı pozan amili işlətməklə olur.Allah hamını müvəffəq etsin!

## Suallar:

**Sual:** Alimlər qeyd edirlər ki, səhra əhli üzürlüdürlər.Onları bəzi hallarda üzürlü edən məsələlər hansılardır? Yaxud bu,

[25] Buxari, kitəbul cihəd və-s-seyr, bəbun lə yuazzəbu biazəbilləh:2016-cı hədis.

Peyğəmbərin dönəmində olan İslamın başlanğıcında olmuşdur?

Cavab: Namazın və zəkatın bəzi ərkanları və bəzi orucu pozan amillər mislində cahil olması mümkün olan işlərdə həm səhra əhli həm də, qeyriləri üzürlü olur.Lakin insan namazı danıb namaz qılmayacağı yaxud orucu danıb oruc tutmayacağı zaman üzürlü olmayacaq.Çünki bu, dindən olması zəruri bilinən işlərdir.Hər bir müsəlman bunu bilir.Bəzi insanlara gizli qalan isə yalnız həccin əməlləri mislində bəzi işlər olur. Lakin onun vacib olması ona gizli qalmır.Bu səbəbdən, həmin şəxs üzürlü olmur.

Sual: Bəzi insanlar deyirlər ki, o, cənabəti bilmir və ondan təmizlənmək üçün qüsl almır.Beləsi bu işdə üzürlüdürmü?

Cavab: Bəzən anlamayan avam insan üzürlü olur.Ələxsus qadınlar.Bu insanı təkfir etmək deyil öyrətmək lazımdır.

Sual: Əgər bir şəxsə zəlalət və bidət kitabları çatarda bu halda üzürlü olacaqmı?

Cavab: Xeyir, xeyir! Bununla üzürlü olmur.Lakin insan bəzən ona gizli qalan müəyyən şeylərdə üzürlü olur.Məsələn həccin və ümrənin vacibləri, orucun vacibləri və bəzən qizli qalan bu kimi şeylər.

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Həmçinin deyiləcək: Əli bin Əbu Talibin (r.a) yandırdığı şəxslərin hamısı müsəlman olduqlarını iddia edirdilər.Onlar Əlinin (r.a) əshabından olmuş və səhabələrdən elm öyrəmişlər.Lakin onlar Əliyə dair Yusuf, Şəmsən və onlar kimilərə dair olan etdiqadda olmuşlar.Necə olur ki, səhabələr onların qətlə yetirilməsinə və küfrünə icma etmişlər?! Məgər siz səhabələrin müsəlmanları təkfir etdiklərini yaxud Təc və onun kimilərə dair etiqadın zərər verməyəcəyini, Əli bin Əbu Talibə dair etiqadın isə insanı kafirə çevirəcəyini düşünürsünüz?”.

## Şərh:

Müəllif Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) çəkdiyi misal vasitəsilə qəbirlərə və övliyalara sitayiş edənlərin təkfir edilməsi məsələsinə dair cahillərin cəhalətini bəyan edir.Çünki onun dönəmində yaşamış bəzi insanlar Tac, Yusuf, Şəmsən kimi kafirlərdən olan bir sıra insanlara ibadət etmələri, onlara qarşı ifrata varmaları və onlara bir növ ilahi vəsflər verərək: Bunu etmək zərər vermir.Çünki onlar saleh insanlardır.Saleh insanlarla təbərrük etmək və onlara dua

etmək zərər vermir,-demələri ilə yanaşı elm iddiasında olmuş və özlərini İslam dininə nisbət etmişlər.

Şeyx (rahiməhullah) onlara bu etiqadın böyük küfr olduğunu bəyan etmişdir.Əgər cahiliyyat əhlinin Lat, Uzza, Mənata, habelə mələklərə və peyğəmbərlərə dair etiqadı onları kafirə çevirmişsə, eynilə bunların Yusuf, Şəmsən, Tac və digər şəxslərə dair etiqadı onları kafirə çevirir.Bu ikisi arasında heç bir fərq yoxdur.Çünki ibadəti Allahdan qeyrisinə yönəltmək şirkdir.Allaha şərik qoşulan məbudun büt yaxud övliya yaxud cin yaxud mələk yaxud başqa bir şey olması eynidir. Səbəb və hikmət, ibadətin Allahdan qeyrisinə yönəldilməsidir. Səbəb məhz budur.Kimliyindən asılı olmayaraq ibadət Allahdan qeyrisinə yönəldiləcəyi zaman bu, böyük şirk olacaq. Uca Allah buyurur: *“Allahdan başqa heç kəsə dua etməyin!”.* (Cinn:18) Habelə buyurur: *“Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: Əgər (Allaha) şərik qoşsan, bütün əməlin puça çıxacaq və mütləq ziyan çəkənlərdən olacaqsan!”.*(əz-Zumər:65) Habelə buyurur: *“Allaha şərik qoşana Allah, şübhəsiz ki, cənnəti haram edər. Onun düşəcəyi yer cəhənnəmdir. Zalımların heç bir köməkçisi yoxdur!”.*(əl-Maidə:72) Habelə buyurur: *“Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan daha kiçik günahları isə istədiyi kimsəyə bağışlayar.”*(ən-Nisə:48) Bu ayə, şirkin bağışlanmayacağına, onun əməlləri puça çıxaracağına və həmin şəxsə cənnəti haram edəcəyinə dəlalət edir.Allah ilə yanaşı ibadət olunan məbudun cin yaxud övliya yaxud mələk yaxud günəş yaxud ay yaxud büt yaxud ağac yaxud başqa şey olması eynidir və hökm ümumidir.

Çünki bütün bu məbudlar Uca Allahın Qurani Kərimdə qeyd etdiyi kimi batildir.Uca Allah buyurur: *“Bu belədir. Çünki Allah Haqdır.Kafirlərin Ondan başqa yalvardıqları isə batildir.”*(əl-Həcc:62) Habelə buyurur: *“Rəbbin yalnız Ona ibadət etməyinizi buyurmuşdur.”*(əl-İsra:23) Habelə buyurur: *“Sizin məbudunuz Tək olan ilahdır.Ondan başqa məbud yoxdur, Mərhəmətlidir, Rəhmlidir.”* (əl-Bəqərə:163) Habelə buyurur: *“Bil ki, Allahdan başqa ibadətə layiq olan heç bir məbud yoxdur.”* (Muhamməd:19) Peyğəmbər Allah tərəfindən elçi olaraq göndərildiyi gündə demişdir: Ey qövmüm! “Lə iləhə illəllah” deyin ki, nicat tapasınız!”.Onları məhz bu cür deməyə əmr etmişdir: “Lə iləhə illəllah”.İnsanlar həmin kəlməni sidqi ürəkdən deyəcəkləri zaman şirk dağılacaq və onlar bununla müsəlman olacaqlar.Ancaq Allahdan qeyrisinə ibadət etdiyi halda onu dilə gətirən şəxsə bu kəlmə, münafiqlərə və yəhudilərə, habelə Allahdan qeyrisinə ibadət edib onu dilə gətirən başqalarına fayda vermədiyi kimi fayda verməyəcək.Əliyə qarşı ifrata varıb ona ibadət edən şəxslər müşrik olmuşlar.Bununla bərabər onlar “lə iləhə illəllah” deyirdilər.Onlar səhabələrin dönəmində olmuş və “lə iləhə illəllah” deyib özlərinin müsəlman olduqlarını demişlər.

Bu səbəbdən, Əliya qarşı ifrata varıb onun Allah olduğunu deyənlər, habelə ona dua edənlər və onu Allahla yanaşı ilah edən şəxslər kafir olmuşlar.Əlinin özü onlara qarşı savaşmış və bütün səhabələr onların qətlə yetirilməsinə dair icma etmişlər.Üstəlik Əli (r.a) onları qılıncla qətlə yetirməmiş, onlara qarşı hədsiz qəzəbi səbəbilə onlar üçün yerdə çalalar qazıb onları onun içinə ataraq odda yandırmışdır.İbn Abbas

(r.a) demişdir: “Əgər onları qılıncla öldürsəydi mənə daha xoş olardı.Çünki yalnız Uca Allah atəşlə əzab verir.” Lakin onlara qarşı şiddətli qəzəbindən dolayı onları odda yandırmışdır. Onların küfrü çox böyük olmuşdur.Onlar Əlini Allah edərək: O, sənsən,-demişlər.Bununla: Sən Allahsan,-demək istəmişlər. Ona dua etmiş, ona qarşı ifrata varmış və onun ibadət olunan ilah olduğunu iddia etmişlər.Günümüzdəki rafizilər Əliyə, Həsənə və Hüseynə qarşı ifrata varıb məhz bu cür hərəkətlər edirlər.Onlara dua edir, onlardan yardım diləyir və onlara nəzr edirlər.Bu, böyük şirkdir.Əhli beytə və Əliyə qarşı ifrata varan imamilər və qeyrilərindən olan rafizilər həmin ifratçıların varisləridir. Ubeyd bin Qaddəh oğullarına dair söhbətdə məsələ bir daha qeyd ediləcək.

Bir sözlə mələyə yaxud peyğəmbərə yaxud Əli kimi səhabəyə yaxud cinə yaxud ağaca yaxud daşa yaxud bütə qarşı ifrata varmaq şirkdir.İnsan Allahı buraxıb ona dua edəcəyi, ondan yardım diləyəcəyi, ona nəzr edəcəyi və qurban kəsəcəyi zaman böyük şirk etmiş olacaq.

Şeyx Muhamməd (rahiməhullah) demişdir: Siz Tac, Şəmsən və onlar mislində olanlara qarşı ifratın zərər vermədiyini Əliyə qarşı ifratın isə zərər verdiyinimi zənn edirsiniz? Bu, böyük cahillikdir.Əgər Tac adlı şəxsə qarşı ifrata varmaq zərər verməsəydi Əliyə qarşı ifrata varmaq ilk növbədə zərər verməzdi.Çünki Əli (r.a) Tac və Şəmsəndən qat-qat fəzilətli bir şəxsdir.Lakin ona qarşı bu cür ifrata varma baş verdiyi zaman onları ölümə layiq olan müşrik və kafirlərdən etmişdir.Tac və Şəmsənə yaxud Abdul-Qadir Ceylaniyə yaxud Həsənə və

Hüseynə yaxud Cəfər bin Muhamməddə qarşı ifrata varanlar ilk növbədə bu vəsfə layiqdirlər.Əli onların hamısından daha fəzilətlidir.Ondan qeyrisinə qarşı ifrata varanlar ilk növbədə kafir olub öldürülməyə layiqdirlər.

Həmçinin Peyğəmbərə (salləllahu aleyhi və səlləm) yaxud digər peyğəmbərlərə ibadət edən şəxs kafir olur.Onlar isə Əlidən daha fəzilətli insanlardır.Kim Muhamməd Peyğəmbərə (salləllahu aleyhi və səlləm) yaxud İdrisə yaxud Musaya yaxud Haruna yaxud İsaya ibadət edərsə kafir olar.Nəsranilər Allahla yanaşı İsaya ibadət etdikləri zaman ən kafir insanlar olmuşlar. Habelə yəhudilər Uzeyirə ibadət etdikləri zaman ən kafir insanlar olmuşlar.Elm tələbəsinin diqqətli olması və ibadəti Allahdan qeyrisinə yönəltməyin mütləq şəkildə Allaha şirk və küfr olduğunu bilməsi gərəkdir.İbadətin peyğəmbərə yaxud saleh insana yaxud cinə yaxud insana yaxud ağaca yaxud daşa yönəldilməsi eynidir və hər biri Allaha şərik qoşmaqdır. İbadətin Bir olan Allaha olması labüddür. *“Bu belədir. Çünki Allah Haqdır.Kafirlərin Ondan başqa yalvardıqları isə batildir.”*(əl-Həcc:62) Uca Allah məhz bu cür buyurur.Uca Allah buyurur: *“Rəbbin yalnız Ona ibadət etmənizi buyurmuşdur.”* (əl-İsra:23) *“Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın!”*.(ən-Nisə:36) *“Siz də bunu bildiyiniz halda heç kəsi Allaha tay tutmayın.”*(əl-Bəqərə:22) Allah hamını müvəffəq etsin!

## Suallar:

Sual: Pis işlərin yayılmasını insanlarda tövhidin zəifliyidən hesab etmək olarmı?

Cavab: Bəli.İnsanlar imanın zəif olması səbəbilə günahlara girirlər.İman güclü olacağı zaman isə insan günahlardan uzaq durur.Günahlara isə yalnız imanı zəif olan və bəsirəti və Allahdan qorxusu az olan şəxslər girirlər.

## Ubeydilərin şəhadəti dilə gətirmələrinə rəğmən sələfin onları təkfir etməsi

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Həmçinin deyiləcək: Abbasilər zamanı Məğrib və Misirə sahib olmuş Ubeyd əl-Qaddəh oğulları.Onların hamısı “lə iləhə illəllah, Muhammədun rasulullah” şəhadətini dilə gətirir, özlərinin müsəlman olduqlarını iddia edir, cümə və camaat namazını qılırdılar.Lakin onlar bizim dindən olmayan bir sıra işlərdə şəriətə zidd gəldikləri zaman alimlər onların kafir olduqlarına, savaşa məruz qalacaqlarına və onların ölkələrinin hərb diyarı olduğuna dair icma etmişlər.Nəhayət müsəlmanlar onlara qarşı yürüşə çıxmış və müsəlman diyarlarını onların əlindən qurtarmışlar.

Həmçinin deyiləcək: Öncəkilər yalnız şirk əməllər etmək, Peyğəmbəri (salləllahu aleyhi və sălləm) və Quranı təkzib etmək, habelə qiyamət gününü inkar etmək kimi işləri bir arada cəm etdikləri zaman kafir olmuşlarsa, elə isə hər məzhəbdə olan alimin qeyd etdiyi başlığın mənası nədir: Mürtədin hökmü fəsili.O isə, İslamdan sonra kafir olan müsəlmandır?! Daha sonra alimlər bir çox növlər qeyd edirlər.Hər növ insanı kafirə çevirir və onun qanı və malının toxunulmazılığı aparır. Habelə onlar insanın edə biləcəyi kiçik şeyləri qeyd edirlər.

Məsələn, insanın qəlbi ilə deyil dili ilə tələffüz edəcəyi söz yaxud zarafat və əyləncə məqsədilə ağızdan çıxan kəlmə.”

## Şərh:

Bu araşdırma, qeyd edildiyi kimi müəllifin dönəmində qəbirlərə və övliyalara tapınan şəxslərə rəddiyədir.Şeyx (rahiməhullah) onların üzərindən hüccətlər qaldırır.Çünki insan, “lə iləhə illəllah, Muhammədun rasulullah” şəhadətini dilə gətirsə belə küfrü gərəkdirən iş görəcəyi zaman kafir olur. Çünki onlar şeyxə etiraz edib deyirlər: Qureyş kafirləri və onlar mislində olanlar “lə iləhə illəllah, Muhammədun rasulullah” şəhadətini dilə gətirmirdilər.Biz isə “lə iləhə illəllah, Muhammədun rasulullah” deyirik və namaz qılıb oruc tuturuq.Sən bizə qarşı Qureyş kafirlərinə dair nazil olan ayələri dəlil gətirirsən.Qureyş kafirləri bütlərə ibadət edir və “lə iləhə illəllah, Muhammədun rasulullah” şəhadətini dilə gətirmirdilər, üstəlik onu təkzib edir onunla savaşırdılar.Biz onlar mislində deyilik!

Müəllif isə qeyd edildiyi kimi, onlar “lə iləhə illəllah” şəhadətini dilə gətirsələr belə onların küfrünü bəyan edən bir çox dəlillər qeyd etmişdir.Habelə münafiqlər “lə iləhə illəllah, Muhammədun rasulullah” şəhadətini dilə gətirir, namaz qılır və oruc tuturdular.Buna rəğmən onlar ən kafir insanlardır və cəhənnəmin ən alt təbəqəsində olacaqlar.Çünki onlar

qəlblərində olmayanı dilləri ilə demişlər.Onlar deyirlər: Şahidlik edirəm ki, Allahdan başqa haqq ilah yoxdur və Muhamməd Onun elçisidir! Əslində isə onlar daxilən onu təkzib edirlər.Həmçinin müsəlmanlar "lə iləhə illəllah" deyən yəhudiləri təkfir etmişlər.

Həmçinin Əliyə (r.a) ibadət edən və ondan yardım diləyən müşriklərdən, habelə günəşə, aya və digər şeylərə ibadət edənlərdən onu deyənlər həmçinin kafir olmuşlar.Çünki onlar namaz qılıb oruc tutsalar belə Allah ilə yanaşı ilahlar etmişlər.Habelə Ubeyd əl-Qaddəh oğulları namaz qılıb oruc tuturdular.Onlar rafizilik və əhli beytə qarşı ifratçılığı, daha sonra isə bəziləri ilahilik iddiasına düşdükləri və Allahla yanaşı ibadətə layiq olduqlarını aşkar etdikləri zaman müsəlmanlar onları təkfir etmiş və onlara qarşı vuruşmuşlar. Onlar küfrü və azğınlığı aşkar etmişlər.Onların əhli beytə qarşı ifrata varmaları yaxud başçılarının ilahilik iddasına düşmələri üzündən küfrü və zəlaləti, onların "lə iləhə illəllah, Muhammədun rasulullah" şəhadətini faydasız etmişdir.

Bütün məzhəblərin imamları (hənbəlilər, şafiilər, malikilər və hənəfilər) kitablarında "mürtədin hökmü fəsili" adlı başlıq açmışlar.O, müsəlmanların icma etdikləri məşhur bir başlıqdır.Onun dəlil mənbəyi Peyğəmbərin (salləllahu aelyhi və səlləm) növbəti sözləridir: "Dinini dəyişəni öldürün!".[26] Muaz bir Cəbəl (r.a) dinini dəyişən haqqında demişdir: "Allahın və Peyğəmbərin hökmüdür." Muaz bunu bir yəhudi İslamı qəbul edib daha sonra dindən çıxdığı zaman demişdir.Muaz

[26] Yuxarıda qeyd edilmişdir.

Əbu Musanın hüzuruna gəldiyi zaman o, həmin şəxsi tövbəyə çağıran insanların arasında idi.Muaz dedi: Öldürülməyincə buranı tərk edən deyiləm.Allahın və Peyğəmbərinin hökmüdür."[27] Çünki o dinini dəyişmişdir.

İslamı iqrar edib ardından küfrü gərəkdirən bir iş görən şəxs həmçinin.Alimlər "mürtədin hökmü fəsli"ndə bəyan etmişlər ki, əgər biri namaz qılıb oruc tutarsa, habelə "lə iləhə illəllah" kəlməsini dilə gətirərsə belə küfrü gərəkdirən iş edəcəyi zaman kafir olacaq.Məsələn: İnsan namaz qılıb oruc tutur.Daha sonra Allahı və Peyğəmbəri söyür.Beləsi namaz qılıb oruc tutarsa belə kafir olur.Habelə orucun vacib olmadığını deyərsə yaxud namazın vacib olmadığını deyərsə, yaxud zinanın və şərabın halal olduğunu deyərsə kafir olacaq. Habelə insan namaz qılıb oruc tutacağı və "lə iləhə illəllah" şəhadətini dilə gətirəcəyi halda belə şənini kiçildərək Quran yazısını ayaq altına atıb ayağını Onun üzərinə qoyar və onu sidiyə batırarsa kafir olar.Yaxud analarla, doğma bacılarla və qızlarla evlənmək halaldır deyərsə bununla kafir olacaq. Habelə ona demişlər: İnsan namaz qılıb oruc tutacağı və "lə iləhə illəllah, Muhamməddun rasulullah" şəhadətini dilə gətirəcəyi halda Allahdan qeyrisinə tapınıb günəşə yaxud aya yaxud bütə yaxud Əliyə yaxud Hüseynə yaxud Fatiməyə yaxud Abdul-Qadirə yaxud Bədəviyə yaxud qeyrisinə ibadət edəcəyi zaman kafir olacaq.

---

[27] Buxari, kitəbu-s`titəbətil murtəddin val muanidin va qitəluhum, bəbu hukmil murtəd val murtəddə:6923. Hədisi Əbu Musa əl-Əşari rəvayət etmişdir.Muslim, kitəbul imərə, bəbu-n-nəhy an taləbil iməarati val hirsi aleyhə:1824-cü hədis.

Bir sözlə insan küfrü gərəkdirən iş görəcəyi zaman bütün əməlləri puça çıxacaq.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: *"Dinini dəyişəni öldürün!"*.[28] Habelə Uca Allah Qurani Kərimdə buyurur: *"Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: Əgər şərik qoşsan, əməlin puç olacaq və mütləq ziyana uğrayanlardan olacaqsan."*(əz-Zumər:65) Habelə buyurur: *"Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları sovrulmuş toz dənəciklərinə çevirərik."*(əl-Furqan:23) Onların əməlləri şirk ilə yanaşı fayda verməyəcək.Üstəlik həmin əməllər sovrulmuş toz dənəciklərinə çevriləcək.Uca Allah buyurur: *"Əgər Ona şərik qoşsaydılar, əlbəttə, etdikləri əməllər puç olardı."*(əl-Ənam:88) Nəticə etibarı ilə insan, söz ilə yaxud fel ilə yaxud şübhə və digər şeylər kimi qəlb ilə küfrü gərəkdirən əməl edəcəyi zaman kafir olacaq.Hətta əgər bir şəxs: Şahidlik edirəm ki, Allahdan başqa haqq ilah yoxdur, lakin mən cənnətin gerçək olub olmamasına dair şübhə edirəm,-deyərsə kafir olacaq.Yaxud: Cəhənnəmin gerçək olub olmamasına dair şübhə edirəm,-deyərsə kafir olacaq. Yaxud Allahın səmada olub olmamasına yaxud Onun ərşin fövqündə olub olmamasına şübhə edərsə kafir olacaq.Çünki o, Allahı və Peyğəmbəri təkzib etmiş olacaq.Yaxud Muhamməd Peyğəmbərin (salləllahu aleyhi və səlləm) nübuvvətinə dair şübhə edib: Onun peyğəmbər olub olmamasını bilmirəm,-deyərsə kafir olacaq. Yaxud Allahın Quranda qeyd etdiyi peyğəmbərlərdən birinin nübuvvətinə dair şübhəyə düşərsə kafir olacaq.Yaxud: Bacım, bibim və ya xalam mənə halaldır və mən onunla evlənə bilərəm,-deyərsə kafir olacaq.Sunnəyə

[28] Yuxarıda qeyd edilmişdir.

əsasən, əgər biri İslamı pozan amillərdən birini edərsə kafir olar və onun bütün əməlləri, namazı, orucu və həcci puç olar. Uca Allah buyurur: *"Əgər Ona şərik qoşsaydılar, əlbəttə, etdikləri əməllər puç olardı."*(əl-Ənam:88) *"İmanı inkar edənin əməlləri boşa çıxar və o, axirətdə ziyana uğrayanlardan olar."* (əl-Maidə5) Bu, müsəlmanların icma etdiyi bir məqamdır.Lakin şirk əhli bunu anlamırlar.Qəbirlərə və övliyalara ibadət edənlər zülmətdə və zəlalətdədirlər.Allah qorusun!

Şeyx (rahiməhullah) bu məsələləri onun zamanında ona etiraz edib: Muhamməd bin Abdul-Vahhəb müsəlmanları təkfir edir, habelə o yeni bir din gətirib,-deyənlərə bəyan etmişdir.Onlar bu sözləri cahillikləri, azğınlıqları və elmdən məhrum olduqları üzündən demişlər.Əslində o, yeni din ixtira etməmişdir.O sadəcə Allahın və Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dediyi sözləri, habelə səhabələrin və sonraki zamanlardaki müsəlmanların yolunu bəyan etmişdir.Allah ona xeyirli mükafatını versin!

## Suallar:

**Sual**: Əgər bir insan qəlbi ilə etiqad etmədən dili ilə küfr söz deyərsə kafir olacaqmı?

**Cavab**: Bəli! İstehza etdiyi halda onu dilə gətirərsə, məsələn: Muhamməd yalançıdır yaxud fırıldaqçıdır,-deyərsə, bunu etiqad etməyəcəyi halda belə kafir olacaq.Habelə əylənərək olarsa belə əgər insan: Allah səmada deyil,-deyərsə kafir olacaq.

Sual: Bəzi bölgələrdə "mutavvi" (dindar) adlandırdıqları şəxsə istehza edirlər.Günlərin birində bir kişi münkər bir işi yasaq etdiyi zaman mövcud olan adamlardan bəziləri: Bu cür adamlar şər əhlidirlər,-demişdir.

Cavab: Məsələ fərqli olur.Əgər insan onun halı yaxud geyimi yaxud görünüşü yaxud yerişi yaxud paltarı yaxud sifəti yaxud miniyinə istehza edərsə bu, günah sayılacaq.Ancaq əgər onun dininə istehza edib dini söyər və təhqir edərsə küfr olacaq.

Sual: Lakin həmin insan ümumiləşdirib: Hər mutavvi şər üzərədir,-demişdir.

Cavab: Bu məsələnin təfsilatı vardır.Onun qəsdinə baxılmalıdır.Əgər onların, dinlərinə görə şərli olduqlarını qəsd edərsə kafir olar.Əgər onların lazımınca araşdırma aparmadıqlarını və insanları bəsirət üzərə dəvət etmədiklərini qəsd edərsə kafir olmaz. Bu üzdən, həmin sözlər müxtəlif ehtimallar daşıyır.

Sual: Əgər biri İslamın hər hansı bir buyuruğuna istehza edib ardından tövbə edərsə onun yenidən şəhadəti dilə gətirməsi lazımdırmı?

Cavab: Lazım deyil.Onun öz xətasını iqrar edib tövbə etməsi kifayətdir.Bəzi fəqihlər isə hesab edirlər ki, onun şəhadəti dilə gətirməsi və inkar etdiyini iqrar etməsi lazımdır.İnsan: Namaz vacib deyil yaxud oruc vacib deyil,-deyib ardından tövbə edəcəyi zaman Allah onun tövbəsini qəbul edəcək.

Sual: İnsan "lə iləhə illəllah" kəlməsinin yeddi şərtini deməzsə onun hökmü nədir?

Cavab: Yetər ki, insan onun mənasına iman etsin.Çünki bəzən avam insanlar onun şərtlərini bilmirlər.Önəmli olan insanın Allaha iman etməsi, Allahdan başqa haqq məbudun olmadığına və Ondan başqasının batil olduğuna iman etməsidir.

Sual: İnsan bəzi sifətləri yaxud bütün sifətləri inkar edəcəyi zaman kafir olurmu?

Cavab: Məsələnin təfsilatı vardır.Beləsinin üzərindən hüccət qalxmalıdır.Çünki bəzən insan bəzi sifətlərdən bixəbər olur. Ona Quran və sunnənin dəlalət etdiyi mənalar bəyan edilməlidir.Onu danacağı zaman kafir olacaq.İnsan ər-Rahmən, əl-Əziz yaxud əl-Hakim yaxud əl-Quddus və əl-Məlik adlarını danacağı zaman kafir olacaq.Əgər avam insan olarsa Qurani Kərimdə və səhih sunnədə gələnlər ona bəyan ediləcək.

Sual: Sifətləri təvil edəcəyi (yozacağı) zaman necə?

Cavab: Təvil fərqli olur.Əşari və qeyrilərindən olan təvil əhlindən bəzisi kafir olur bəzisi isə kafir olmur.Təvildə şübhə vardır.Mötəzililər və cəhmilər isə fərqlidirlər.Onlar kafirdirlər.Çünki onlar bütövlüklə Allahın sifətlərini və adlarını inkar etmişlər.

Sual: Bəzi insanlar deyirlər: Əgər sənə: Ey mutavvi!-deyilərsə, sən cavab olaraq: Ey asikar!- deyəcəksən.Bu, doğrudurmu?

Cavab: Bunu deyən insana bəyan etmək lazımdır ki, mutavvi, Allaha itaət edəndir.Kim özünü Allaha itaət etdirərsə Allaha böyun əymiş olar.Avam insanlara görə mutavvi alimdən aşağı

və adi insandan yuxarı bir şəxsdir.Bu, onlara görə istehza deyil şərəfli bir ləqəbdir.

## Küfrü gərəkdirən əməli edən şəxs kafir olur

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Həmçinin deyiləcək: Uca Allah ayədə qeyd olunan insanlar haqqında buyurur: *“Allaha and içirlər ki, nalayiq sözlər deməyiblər.Onlar küfr sözünü demiş və İslamı qəbul etdikdən sonra kafir olmuşlar.”*(ət-Təubə:74) Məgər Allahın onları, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) dönəmində olub onunla birlikdə cihad etmələrinə, habelə namaz qılmaları, zəkat verməlari, həcc etmələri və Allahı təkləşdirmələrinə rəğmən bir kəlməyə görə təkfir etdiyini eşitmədin? Habelə Uca Allah növbəti ayədə gələn şəxslər haqqında buyurur: *“De: Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz? (Əbəs yerə) üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz.”*(ət-Təubə:65-66) Uca Allah onların iman gətirdikdən sonra kafir olduqlarını bildirmişdir.Onlar isə Təbuk yürüşündə Peyğəmbərlə (salləllahu aleyhi və səlləm) birgə olmuşlar. Onlar müxtəlif ifadələr işlətmiş və onu zarafatca dediklərini qeyd etmişlər. Bu şübhə haqqında düşün! Onlar deyirlər: Siz “lə iləhə illəllah” şəhadətini gətirən və namaz qılıb oruc tutan müsəlmanları təkfir edirsiniz.Daha sonra onun cavabı haqqında düşün! Çünki o, bu vərəqlərdə olan ən faydalı şeydir. Buna dair digər dəlil olaraq, Uca Allah xəbər vermişdir ki, İsrail oğullarının müsəlman, elm və təqva sahibləri olmaları-

na rəğmən onlar Musaya belə demişlər: *"Onların məbudları olduğu kimi, bizim üçün də bir məbud düzəlt".*(əl-Əraf:138) Habelə səhabələrdən bəzi insanlar demişlər: Bizim üçün zətul ənvat[29] düzəlt.Peyğəmbər (salləllahu aleyhi və səlləm) bunun eynilə İsrail oğullarının *"bizim üçün də bir məbud düzəlt"* sözü mislində olduğuna and içmişdir.Lakin müşriklərin bu əhvalata dair gətirdikləri bir şübhəsi vardır.Onlar deyirlər: İsrail oğulları bununla kafir olmadılar.Habelə "zətul ənvat" istəyən şəxslər kafir olmadılar.Cavab olaraq deyəcəyik: İsrail oğulları bunu etmədilər.Habelə Peyğəmbərdən (salləllahu aleyhi və səlləm) bunu istəyənlər bunu etmədilər.İxtilaf yoxdur ki, İsrail oğulları bunu etməmişlər.Əgər onlar bunu etsəydilər kafir olar-dılar.Habelə ixtilaf yoxdur ki, əgər Peyğəmbərin (salləllahu aleyhi və səlləm) qadağasını görən şəxslər ona itaət etməsəydilər və qadağadan sonra "zətul ənvat" düzəltsəydilər kafir olardılar. Məqsəd məhz budur.Lakin bu əhvalat müsəlmanın, üstəlik alimin bəzən haqqında bilgisiz olduğu halda şirkin hər hansı bir növünə düşə biləcəyini, habelə öyrənməyin və qorunma-ğın əhəmiyyətini, habelə cahil insanın: Tövhidi anlamışıq,-deməsinin ən böyük cahillik və şeytanın tələsi olmasına dair bilgini ifadə edir.Habelə müsəlmanın, bilmədiyi halda küfr sözü dilə gətirəcəyi və ardından buna diqqəti çəkildikdə dərhal tövbə edəcəyi zaman kafir olmayacağını ifadə edir. Buna misal, İsrail oğulları və Peyğəmbərə (salləllahu aleyhi və səlləm) müraciət edən insanlardır.Habelə insan kafir olmazsa belə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) etdiyi kimi beləsinə sərt sözlərin deyiləcəyini ifadə edir."

---

[29] Zətul ənvat: Müşriklərin təbərrük məqsədilə öz qılınclarını asdıqları ağacdır.

## Şərh:

Müəllif (rahiməhullah) bəyan etmişdir ki, müsəlman dindən xaric olmağı gərəkdirən bir amil işlədəcəyi zaman İslamdan çıxacaq.Habelə cahillərin: Siz, "Lə iləhə illəllah, Muhamməduni rasulullah" şəhadətini dilə gətirən, namaz qılıb oruc tutan müsəlmanları təkfir edirsiniz,- dedikləri söz doğru deyil və bu, ən böyük cahillikdir. Müsəlman, namaz qılıb oruc tutarsa belə İslamdan xaric olmağı gərəkdirən amil işlədəcəyi zaman mürtəd olacaq.Uca Allah buyurur: *"Allaha and içirlər ki, nalayiq sözlər deməyiblər.Onlar küfr sözünü demiş və İslamı qəbul etdikdən sonra kafir olmuşlar."*(ət-Təubə:74) Habelə buyurur: *"De: Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz? (Əbəs yerə) üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz."*(ət-Təubə:65-66) Onlar isə Peyğəmbərlə (salləllahu aleyhi və səlləm) birgə olmuşlar.Buna rəğmən həmin küfr sözləri dilə gətirib müsəlman olduqdan sonra kafir olmuşlar. Əgər bir şəxs insanlar içində ən abid insan olarsa belə küfr işlədəcəyi zaman küfr onu İslam dairəsindən küfr dairəsinə çıxaracaq.Bu səbəbdən, bütün imamlar "mürtədin hömünə dair fəsil" başlığı altında fəsil açmış və onun İslama girdikdən sonra kafir olmuş müsəlman olduğunu vurğulamışlar. Habelə İsrail oğulları demişlər: *"Onların məbudları olduğu kimi, bizim üçün də bir məbud düzəlt".*(əl-Əraf:138). Həmçinin Huneyn yürüşünə gedərkən bəzi müsəl-

manlar demişlər: "Ey Allahın elçisi! Onların "zətul ənvat" ağacı olduğu kimi bizim üçün də "zətul ənvat" düzəlt! Peyğəmbər (salləllahu aleyhi və səlləm) isə onlara cavab olaraq demişdir: Subhanəllah! Bu, Musanın qövmünün dediyi kimidir: *"Onların məbudları olduğu kimi, bizim üçün də bir məbud düzəlt".*Canım əlində Olana and olsun ki, siz özünüzdən öncəkilərin getdiyi yola düşəcəksiniz."[30] Onlar bunun icazəli olduğunu və qəbahətsiz iş olduğunu düşünmüşlər. Peyğəmbər (salləllahu aleyhi və səlləm) bunun böyük yanlışlıq olduğunu onların nəzərinə çatdırmışdır.Əgər onlar müxalif olub "zətul ənvat" düzəltsəydilər kafir olardılar.Həmçinin əgər İsrail oğulları ilahlara ibadət edib haqqa boyun əyməsəydilər kafir olardılar.

Bir sözlə bu əhvalatlarda, küfr işlədən şəxsin kafir olacağına dair ən aydın bəyan və ən aşkar hüccət vardır.Lakin insan bir şeyin haqq olduğunu zənn etdiyi halda onu etməyə qalxarsa ardından onun diqqətinə çatdırılarsa cahilliyi səbəbilə bununla kafir olmaz.Müsəlman bundan cahil olmayacağı zaman isə onun tövbə edib Allaha qayıtması gərəkdir.Uca Allah tövbə edənin tövbəsini qəbul edir.Bəzən insan bir çox səbəblərə görə küfrə düşür.Bu səbəblərdən, cahillik, habelə nəfsi istək, dünya mənfəətinə olan tamah, itaətini vacib gördüyü şəxsə itaət v.s. İnsanın diqqətinə catdırılacağı və həmin şəxs tövbə edəcəyi zaman edəcəyi əməl ən böyük günah olarsa belə tövbəsi doğru olacaq.Çünki hər bir günahın tövbəsi vardır.Ən böyük günah isə şirkdir.Allaha tövbə edənin Allah

---

[30] Tirmizi, bəbu mə cəə lətərkəbunnə sənənə mən kənə qabləkum:2180-cı hədis. Əhməd:21947-ci hədis.

tövbəsini qəbul edir.Artıq Qureyşin bir çox igid oğulları küfr üzərə olmuş daha sonra Allah onlara hidayət vermiş və onlar İslama hidayət ediləndən sonra ən xeyirli və fəzilətli insanlardan olmuşlar.Onlardan bəziləri Hudeybiyyə sülhündən sonra, digərləri isə Məkkənin fəthindən sonra İslama girmişlər. Bu isə, böyük küfrdən və Peyğəmbərin və onun əshabının onlarla savaşmasından sonra olmuşdur.Onlardan biri, Uhud günü və Xəndək günü kafirlərin başçısı olmuş Əbu Sufyandır.Buna rəğmən o, İslama girmiş və sonralar ən xeyirli insanlardan olmuşdur.Habelə İkrimə bin Əbu Cəhl, Safvən bin Umeyyə və başqaları.

İnsan səmimi qəlbdən tövbə edəcəyi zaman Uca Allah onun tövbəsini qəbul edəcək.Habelə insan cahilliyi üzündən küfr etməyə qalxdığı zaman ona bəyan edilir və dərhal təkfir olunmur.Buna misal olaraq: Bizim üçün "zətul ənvat" düzəlt,- deyənlərin sözünü, habelə: *"Onların məbudları olduğu kimi, bizim üçün də bir məbud düzəlt"* deyənlərin sözünü göstərmək olar.Onlar bunun yaxşı və qəbahətsiz bir iş olduğunu hesab etmişlər.Bu yanlışlıq onların diqqətinə çatdırıldığı zaman onlar tövbə etmiş, Allaha qayıtmış və Allahın onlara qadağan etdiyi işi etməmişlər.

Xülasə: Namaz qılan və oruc tutan müsəlman İslama nisbət olunduğu halda küfrü gərəkdirən bir amil işlədəcəyi zaman onun namaz qılan və İslama nisbət edilən olması onun təkfir edilməsinə mane olmayacaq.Üstəlik həmin şəxs hasil olan yeni küfr ilə mürtəd olacaq və onun bütün əməlləri puça çıxacaq. *"Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları*

*sovrulmuş toz dənəciklərinə çevirərik."*(əl-Furqan:23) Habelə hədisdə gəlmişdir: "Dinini dəyişəni öldürün."[31] Bu fəsil, mürtədin hökmü fəsili kimi məşhurdur.O, İslamdan sonra kafir olan müsəlmandır. Əgər o, ən abid insan olarsa daha sonra Allahı yaxud Peyğəmbəri söyərsə yaxud Allahdan savayı ilaha tapınar və ona dua edərsə, ondan yardım istəyərsə yaxud namazın və ya zəkatın vacibliyini danarsa yaxud zinanın və ya şərabın haramlığını danarsa və bu kimi işlər hasil olarsa onun bütün əməlləri puça çıxar və buna görə təkfir olunar.Küfr edən şəxsin əməlləri puç olur və toz dənəciklərinə çevrilir. *"Əgər Ona şərik qoşsaydılar, əlbəttə, etdikləri əməllər puç olardı."*(əl-Ənam:88) "Habelə buyurur: *"Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur: Əgər şərik qoşsan, əməlin puç olacaq və mütləq ziyana uğrayanlardan olacaqsan."*(əz-Zumər:65) Habelə buyurur: *İmanı inkar edənin əməlləri boşa çıxar və o, axirətdə ziyana uğrayanlardan olar."* (əl-Maidə5)

Hər bir müsəlmanın Allahın qadağan etdiyi bütün günahlardan qorunması gərəkdir.İnsanın şirkdən daha çox çəkinməsi gərəkdir.Onun özünə arxayın olub: Mən tövhidi və İslamı anlamışam,-deməməsi gərəkdir.Xeyir! Arxayın olmaq doğru deyil.Bəzi insanlar cahil olduqları halda: Biz tövhidi anlamışıq,-deyirlər.Əslində həmin insan hələ də onu anlamayıb. Hətta əgər onu anlayıb və qəlbinə ona dair bilgi giribsə onun həzər etməsi, arxayın olmaması və Rəbbindən sabitlik diləməsi gərəkdir.Yəni, dində bilik istəməsi gərəkdir.Habelə Rəbbinin onu əyrilikdən qorumasını diləməsi gərəkdir.

[31] Yuxarıda qeyd edilmişdir.

Neçə-neçə insanlar olmuşdur ki, öyrənib dinin biliklərinə sahib olmuş sonra isə əyriliyə düşmüşdür.Allah qorusun!

## Suallar:

Sual: İnsan tövbə edəcəyi zaman tövbədən sonra onun keçmiş əməlləri özünə qayıdırmı?

Cavab: İnsan tövbə edəcəyi zaman etdiyi əməlləri onun özünə qayıdacaq.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Keçmişdə etdiyin xeyir üzərə İslama gəldin."[32] İnsan yalnız küfr üzərə öləcəyi zaman əməllərindən məhrum olacaq.Çünki Uca Allah buyurur: *"Kafir kimi ölənlərin də tövbəsi qəbul deyildir".* (ən-Nisə:18) İnsan küfr üzərə öləcəyi zaman əməllərindən məhrum olacaq.Lakin İslama gəldiyi üçün hidayət üzərə qalacaq.

Sual: İnsan mürtəd olduğu halda öləcəyi zaman onun əməlləri puça çıxacaqmı?

Cavab: Hər şey puça çıxır.İnsan mürtəd olaraq ölərsə bütün əməllər batil olacaq.Uca Allah buyurur: *"Biz onların etdikləri əməllərə baxdıqdan sonra onları sovrulmuş toz dənəciklərinə çevirərik."*(əl-Furqan:23)

Sual: Bəzi insanlar deyirlər: Müəyyən şəxs təkfir olunmaz.

Cavab: Bu, cahillikdir.Ondan küfr sadir olacağı zaman təkfir olacaq.

---

[32] Muslim, kitəbul imən, bəbu bəyəni hukmi aməlil kəfir izə əsləmə bədəh:123-cü hədis.

Sual: İnsan danmayacağı halda belə bir şeyə nifrət edərsə onun hökmü nədir?

Cavab: *“Bu, ona görədir ki, onlar Allahın nazil etdiyinə nifrət etdilər.O, da onların əməllərini puça çıxartdı.”*(Muhammməd:9) Kim Allahın nazil etdiyinə nifrət edərsə onun bütün əməli puça çıxar.Əgər biri namaz qılacağı halda belə namaza nifrət edərsə yaxud həcc edəcəyi halda belə həccə nifrət edərsə yaxud zina və şərabın haram olduğuna nifrət edərsə bütün əməli puça çıxar.

Sual: Saqqları qırxmağı pis görməyənin hökmü nədir?

Cavab: Bu, mübahisəli məsələdir.Burada şübhə vardır.Çünki bəzi alimlər saqqların vacib olmadığını demişlər.Lakin Allahın saqqala dair buyuruğuna nifrət edən şəxs kafir olur. Çünki ən azı onun sunnə olduğu deyiləcək.

Sual: Əgər biri İslamın ərkanlarından birinə nifrət edərsə onun hökmü nədir?

Cavab: *“Bu, ona görədir ki, onlar Allahın nazil etdiyinə nifrət etdilər.O, da onların əməllərini puça çıxartdı.”*(Muhammməd:9)

Sual: Cəhmiyyə firqəsi murciələrə hər cəhətdən bənzəyirmi?

Cavab: Cəhmiyyə firqəsi insanın öz əməlində məcbur olduğunu hesab edirlər.Onlar murciə deyil mucbirə firqəsidir. Onlar insanın etdiyində məcbur olduğunu və buna görə heç bir günah daşımıdığını hesab edirlər.Onların sözündən Allahın zülm edən olduğu nəticəsi çıxır.

**Sual: Onlar murciələrə imanın yalnız qəlbdə olan təsdiq olması etibarı ilə bənzəyirlərmi?**

**Cavab: Cəhmilərə görə iman bilgidir.**

## Növbəti şübhəyə cavab: Əgər biri, İslamı pozan amillərdən hər hansı birini edərsə "lə iləhə illəllah" dediyi sürəcə kafir olmaz

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

"Müşriklərin başqa bir şübhəsi vardır.Onlar deyirlər: Peyğəmbər (salləllahu aleyhi və səlləm) Usaməyə, onun "lə iləhə illəllah" deyən şəxsi öldürməsinə irad tutub dedi: O "lə iləhə illəllah" deyəndən sonramı onu öldürdün?!".[33] Habelə demişdir: "Mən insanlara qarşı, onlar "lə iləhə illəllah" sözünü deyincəyə qədər savaşmağa əmr olundum."[34] Habelə "lə iləhə illəllah" deyən şəxsin rahat buraxılmasını ifadə edən digər hədislər. Həmin cahillər bununla, nə edirsə etsin həmin sözü deyənin kafir olmayacağını və öldürülməyəcəyini qəsd edirlər.

Bu cahillərə deyiləcək: Məlum olduğu kimi Peyğəmbər (salləllahu aleyhi və səlləm) "lə iləhə illəllah" deyən yəudilərə qarşı vuruşmuş və onları əsir almışdır.Habelə Peyğəmbərin (salləlla-

[33] Buxari, kitəbu-d-diyət, bəbu qaulihi təalə "va mən əhyəhə fəkəannəmə əhyə-n-nəsə cəmia":2478.

[34] Buxari, kitəbul imən, bəbu fəin təbu va əqamu-s-salətə va ətəvu-z-zəkətə fəxalu səbiləhum:25-ci hədis.Muslim, kitəbul imən, bəbul əmri biqitəli-n-nəs hattə yəqulu "lə iləhə illəllah Muhammədun rasululah" va yuqimu-s-saləh:22-ci hədis.

hu aleyhi və səlləm) səhabələri "lə iləhə illəllah, Muhammədun rasulullah" şəhadətini dilə gətirən, namaz qılıb oruc tutan və müsəlman olduqlarını iddia edən Bunu Hanifə qəbiləsinə qarşı vuruşmuşlar.Habelə Əli bin Əbu Talib (r.a) bu cür insanları odda yandırmışdır.Lakin bu cahillər, "lə iləhə illəllah" deyib qiyamət gününü inkar edənin, habelə İslamın ərkanlarından birini dananın təkfir edilib öldürüləcəyini iqrar edirlər.Necə olur ki, insan dinin şaxəli məsələlərindən birini dandığı zaman həmin kəlmə ona fayda vermir ancaq peyğəmbərlərin gətirdiyi dinin əsası və məramı olan tövhidi danacağı zaman fayda verir?! Əslində Allahın düşmənləri hədislərin mənasını anlamamış və heç anlamayacaqlar da! Usamənin (r.a) hədisinə gəldikdə isə, o, müsəlman olduğunu iddia edən şəxsi öldürmüşdür.Lakin Usamə onun yalnız canı və malından ötrü qorxduğu üçün İslamı iddia etdiyini düşünmüşdür.Belə ki, bir insan İslamı izhar edəcəyi zaman ondan İslama müxalif bir amil bəlli olmayınca onu rahat buraxmaq vacibdir.Uca Allah buna dair buyurur: *"Ey iman gətirənlər! Allah yolunda döyüşə çıxdığınız zaman kiminlə vuruşacağınızı yəqin edin."*(ən-Nisə:94) Ayə onun rahar buraxılmasının və yəqin olmağın vacibliyinə dəlalət edir.Lakin əgər bunun ardından insanın İslama müxalif bir amil etməsi bəlli olarsa o, qətlə məruz qalar.Çünki Uca Allah "*yəqin edin*",-deyə buyurur. Əgər insan onu deyəcəyi zaman mütləq şəkildə qətlə yetirilmirsə, belə olan halda yəqin olmağın nə mənası var?!

Habelə digər hədis və bu mənada qeyd etdiyimiz başqa hədislərdən bəlli olur ki, tövhidi və İslamı aşkar edən şəxsi, bunu pozan amilə düşdüyü bəlli olmayacağı təqdirdə rahat

buraxmaq vacibdir.Buna dəlil olaraq, Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “O, “lə iləhə illəllah” deyəndən sonramı onu öldürdün?!”.[35] Habelə demişdir: “Mən insanlara qarşı, onlar “lə iləhə illəllah” sözünü deyincəyə qədər savaşmağa əmr olundum.”[36] Habelə Peyğəmbər (salləllahu aleyhi və səlləm) Xəvariclər barədə demişdir: “Onlara harada rast gəlsəniz, orada öldürün! Əgər mən onlara yetişsəydim onları ad tayfası qırıldığı tək qətlə yetirərdim.”[37] Buna rəğmən onlar ən çox ibadət və zikr edən insanlar olmuşlar.Hətta səhabələr onların yanında öz namazlarını əksik görürdülər.Həmin insanlar isə elmi səhabələrdən almışdılar.Onlar şəriətə müxalifliyi aşkar etdikləri zaman “lə iləhə illəllah” şəhadəti, çoxlu ibadət və İslam iddiası onlara fayda verməmişdir.Habelə bizim yəhudilərə qarşı savaşa və səhabələrin Bənu Hənifə qəbiləsinə qarşı savaşlarına dair qeyd etdiklərimiz.Habelə bir kişi Bənu əl-Mustaləq qəbiləsinin zəkat verməkdən imtina etdiklərini xəbər verdiyi zaman Peyğəmbər (salləllahu aleyhi və səlləm) onlara qarşı yürüşə çıxmaq istəmişdir.Bu ərəfədə Uca Allah Quran nazil edib demişdir: *“Ey iman gətirənlər! Əgər bir fasiq sizə bir xəbər gətirərsə, onu araşdırın.”*(əl-Hucurat:6) Həmin kişi onlara qarşı yalan danışmışdır.

---

[35] Buxari, kitəbul məğazi, bəbu bəsi-n-nəbiyyi usəmə bin zeyd:4269-cu hədis.Hədisi Usamə bin Zeyd (r.a) rəvayət etmişdir.Muslim, kitəbul imən, bəbu təhrimi qatlil kəfir bədə ən qalə lə iləhə illəllah:69-cu hədis.

[36] Yuxarıda qeyd edilmişdir.

[37] Buxari, kitəbul mənaqib, bəbu aləməti-n-nubuvvati fil isləm:3611-ci hədis. Muslim, kitəbu-z-zəkət, bəbu-t-təhridi alə qatlil xəvaric:1066-ci hədis.

Bütün bu qeyd edilənlər, həmin adamların dəlil olaraq gətirdikləri hədislərdə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bizim qeyd etdiyimizi qəsd etməsinə dəlalət edir.”

## Şərh:

Bu, çox önəmli və böyük məsələdir.Müəllif (rahiməhullah) onu izah etmişdir.Həmin məsələ: Müşriklər, “lə iləhə illəllah” sözünü deyən şəxsin rahat buraxılmasını əmr edən mütləq və ümumi hədislərdən yapışırlar.Habelə onlar düşünmüşlər ki, onu deyən şəxs etdiyi əməlindən asılı olmayaraq kafir olmur.Bəziləri isə cahillikləri səbəbilə zənn etmişlər ki, onu deyən şəxs şirkdən daha kiçik əməllər etməklə kafir olur. Peyğəmbər (salləllahu aleyhi və səlləm) Usaməyə demişdir: “O, “lə iləhə illəllah” deyəndən sonramı onu öldürdün?!”.[38] Habelə demişdir: “Mən insanlara qarşı, onlar “lə iləhə illəllah” sözünü deyincəyə qədər savaşmağa əmr olundum.”[39] Bu hədislər, mürtədlərə qarşı savaşda səhabələrin və qeyrilərinin tutduqları yola dəlildir.Habelə burada, müxalif şeyin sadir olması bilinməyənə qədər tövhidi və İslamı aşkar edən şəxsin rahat buraxılması mənası vardır.Usamə həmin şəxsin qorunaraq və silahdan qorxaraq bu sözü dediyini düşünmüş və bu səbəbdən, onu öldürmüşdür.Peyğəmbər (salləllahu aleyhi və səlləm) onun

---

[38] Yuxarıda qeyd edilmişdir.

[39] Yuxarıda qeyd edilmişdir.

yanlış addım atdığını bildirmiş və beləsinin işinə baxılana qədər onun rahat buraxılmasının vacib olduğunu bəyan etmişdir.

"Lə iləhə illəllah" deməyən hər bir insan, Qureyş kafirləri mislində onu deməkdən imtina edən kafirlərdən sayılır.Peyğəmbər Qureyşə: "lə iləhə illəllah" deyin,-söylədiyi zaman onlar demişlər: *"O, bütün məbudları bir məbudmu etdi? Həqiqətən, bu, əcaib bir şeydir."*(Sad:5) Habelə demişlər: *"Çünki onlara: Allahdan başqa ibadətə layiq olan məbud yoxdur!-deyildikdə təkəbbür göstərir və deyirdilər: Məgər bir məcnun şairə görə məbudlarımızı tərk edəcəyik?".*(əs-Saffət:35-36) "Lə iləhə illəllah" şəhadətini danan şəxslər onu deyəcəkləri zaman, onların işinə baxılana qədər rahat buraxılacaqlar.Onlar doğru-dürüst olsalar, Allahı təkləşdirsələr, ibadəti xalis Ona aid etsələr və şəriətin buyuruqlarına riayət etsələr onların müsəlman olmaları bəlli olar və onlar tamamilə rahat buraxılarlar. Ancaq onun mənasına iman etməyən və onu etiqad etməyən şəxs fərqlidir.Bəziləri Allahdan qeyrisinə ibadət etdikləri halda "lə iləhə illəllah" deyirlər.Habelə münafiqlər yaxud Museyliмənin əshabı belə edirdilər.Onlar "lə iləhə illəllah" şəhadətini gətirir, namaz qılır və deyirdilər: Museylimə peyğəmbərdir.Onlar bunu etməklə Uca Allahın kəlamını təkzib etmiş olurlar: *"Muhəmməd aranızdakı kişilərdən heç birinin atası deyildir. Lakin o, Allahın Elçisi və peyğəmbərlərin sonuncusudur."*(əl-Əhzab:40) Sonuncu peyğəmbər Muhamməd (salləllahu aleyhi və səlləm) olduğu bir halda o necə peyğəmbər ola bilər?! Bu səbəbdən, səhabələr onlara qarşı vuruşmuşlar. Çünki onlar Museylimənin peyğəmbər olduğunu iddia

etmişlər.Bu, icma ilə küfrdür.Onların "lə iləhə illəllah" deməsi isə faydasız.Habelə Əli bin Əbu Talibin yandırdığı insanlar onun ilah, üstəlik Allah olduğunu iddia etmişlər. Onlar həmçinin "lə iləhə illəllah" sözünü dilə gətirirdilər.Onlar əməllərinə uyğun gəlməyən sözü dilə gətirirdilər.

Habelə münafiqlər "lə iləhə illəllah" deyir lakin onun batil bir söz oduğunu və onun gerçəyə dayanmayan söz olduğunu etiqad edirdilər.Onlar həmin sözü riyakarlıq və qorunmaq üçün deyirdilər.Onların bu kəlməni demələrinə rəğmən Uca Allah buyurur: *"Həqiqətən, münafiqlər odun ən aşağı təbəqəsində olacaqlar".*(ən-Nisə:145) Onlara, dilə gətirdikləri "lə iləhə illəllah" sözü fayda verməyəcək.Çünki onlar həmin sözü dili ilə demiş və daxildə onun mənasına küfr etmişlər. *"Münafiqlər, həqiqətən də, Allahı aldatmağa çalışırlar.Halbuki Allah onları aldadır.Onlar namaza durarkən könülsüz qalxar, özlərini camaata göstərər və Allahı olduqca az yad edərlər. Onlar imanla küfrün arasında tərəddür edir, nə bunlara, nə də onlara tərəf olurlar."*(ən-Nisa:142-143) Onların imanı yoxdur. Habelə Allahdan qeyrisinə ibadət etdiyi yaxud qiyamət gününü və insanların diriləcəyini inkar etdiyi yaxud namazın vacibliyini inkar etdiyi yaxud zinanı və ya şərabı halal gördüyü halda "lə iləhə illəllah" deyən şəxs, bütün müsəlmanlara görə bununla kafir olur.

Bu səbəbdən, hər məzhəbdən olan alimlər kitablarında "mürtədin hökmü fəsli" adlı başlıq açmışlar.Onlar demişlər: Mürtədin hökmü fəsli.Daha sonra bunu açıqlayıb demişlər: Mürtəd, İslama girəndən sonra kafir olan şəxsdir.Yəni, "lə

iləhə illəllah" demiş olsa belə İslamı pozan hər hansı bir amil etdiyi səbəbilə kafir olan şəxs.Əgər insan "lə iləhə illəllah" dediyi, namaz qılıb oruc tutduğu halda zinanın halal və qəbahətsiz bir iş olduğunu deyərsə yaxud şərabın halal olduğunu deyərsə yaxud valideyinlərin üzünə ağ olmaq olar deyərsə elm əhlinin icmasına əsasən kafir olar.

İnsanın ayıq, diqqətli, müdrik və dində bilikli olması gərəkdir.Müsəlman, İslamın bütün buyuruqlarını edəcəyi halda belə İslamı pozan amillərdən birini işlədəcəyi zaman dindən çıxır.Belə ki, insan Bədəviyə yaxud Peyğəmbərə yaxud Zeynəbə yaxud Həsənə yaxud Hüseynə yaxud Əliyə və ya qeyrisinə ibadət edib onlardan yardım diləyərsə kafir olar və dilə gətirdiyi "lə iləhə illəllah" kəlməsi ona heç bir fayda verməz.Habelə "lə iləhə illəllah" desə belə mələklərə yaxud cinlərə dua edib onlardan yardım diləyəcəyi zaman kafir olur. Habelə insan, Qureyşin Uzza, Lat və Mənata dua etdiyi kimi ağaclara yaxud daşlara yaxud bütlərə dua edəcəyi zaman kafir olur.

Müsəlmanın elmli olub dinində açıq-aydın dəlillərə sahib olması gərəkdir.Müşrik "lə iləhə illəllah" deyərsə belə müşrikdir.Habelə kafir "lə iləhə illəllah" deyərsə belə kafirdir.Onun mənasına iman edib onun haqqını yerinə yetirməsi lazımdır.Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: "Mən insanlara qarşı, onlar "lə iləhə illəllah" sözünü deyincəyə qədər savaşmağa əmr olundum.Onlar "lə iləhə illəllah" deyəcəkləri zaman onun haqqı istisna olmaqla məndən qanlarını

və mallarını qorumuş olarlar."[40] Habelə insan "lə iləhə illəl-lah" kəlməsini desə belə mələklərə yaxud cinlərə dua edib onlardan yardım diləcəyi zaman kafir olacaq.İbn Ömərin (r.a) hədisində gəldiyi kimi: "İslamın haqqı istisnadır, onların sorğu-sualı isə Allaha aiddir".İslamın və "lə iləhə illəllah" kəlməsinin haqqının olması labüddür.O isə, Allahın dininə riayət etmək və şirkə yaxud Allahı və Peyğəmbəri təkzib etməyə səbəb olan işlərdən yan durmaqdır.Əgər bir insan bütün ibadətləri edər və Allahın vacib buyurduğu hər bir şeyi etiqad edərsə lakin misal üçün: Qiyamət günü, habelə cənnət və cəhənnəm yoxdur,-deyərsə yekdil olaraq kafir olar.Həmin insanın namaz qılması, oruc tutması və hətta ən abid insan olması belə onun karına çatmaz.Habelə əgər bir insan hər bir şeyə iman edərsə lakin zinanın yaxud şərabın halal olduğunu yaxud namazın, Ramazan orucunun və imkan olduğu halda həccin vacib olmadığını deyərsə yekdilliklə kafir olar.Bu işlə-rə diqqət yetirmək gərəkdir.Elm tələbəsinin elm və bəsirət üzərə olması və qəbirlərə ibadət edib ölülərdən yardım istəyən və özlərinin müsəlman olduğunu deyən həmin mürtədlərin və azmış cahillərin sözlərinə aldanmaması gərək-dir.Allah qorusun və hamını doğru yola müvəffəq etsin!

## Suallar:

[40] Yuxarıda qeyd edilmişdir.

Sual: Duada: Ey sevgilim!-deyib Allahı qəsd edənin yaxud: Ey asanlığa çıxaran!- yaxud: Ey Bələdçim!-deyənin hökmü nədir?

Cavab: Burada qəbahətsiz bir şey yoxdur.Uca Allah ən çox seviləndir.Lakin insan Allahı adları ilə çağırıb: Ey Allah! Ey Rəhman!-deyərsə daha yaxşı olar.Çünki Uca Allah buyurur: *“Ən gözəl adlar Allahındır.Ona bu adlar vasitəsi ilə dua edin.”*(əl-Əraf:180) Uca Allah: Məni ey sevgilim deyə çağırın!-deməmişdir.Onu gözəl adları ilə çağırıb: Ey Allah! Ey Rəhman! Ey Rahim! Ey Zul cələli val ikram!-deyin.Uca Allah ən çox sevilən olsa da Onu, bəyan etdiyi adlarla çağırmaq daha doğrudur.

Sual: Hər hansı bir işdən ötrü Allah xatirinə istəyib, istədiyini almayanın hökmü nədir, habelə bir şəxsdən Allah xatirinə bir şey istəsələr lakin o etməsə onun hökmü nədir?

Cavab: Peyğəmbər (salləllahu aleyhi və səlləm) demişdir: “Allah xatirinə istəyənə verin.”[41] Lakin əgər insanın haqqı olmadığı və onun əhlindən olmadığı halda: Allah xatirinə mənə zəkatdan verin,-deyərsə, ona verilməz.Lakin şübhə olan bir şey istəyəcəyi zaman, beytul-maldan bir şey istəyəcəyi zaman yaxud kasıb olduğu üçün istəyəcəyi zaman ona müəyyən qədər mal veriləcək. “Allah xatirinə istəyənə verin.” Lakin insanın Allah xatirinə istəməsi və insanlara təkid etməsi düzgün deyil.Bu səbəbdən, cüzəm xəstəsi, kor və dazbaş adamların

[41] Əbu Davud, kitəbu-z-zəkət, bəbu atiyyəti mən səələ billəh:1672-ci hədis.Nəsai, kitəbu-z-zələt, bəbu mən səələ billəh:2567-ci hədis.Hədisi ibn Ömər (r.a) rəvayət etmişdir.

yanına gələn mələk demişdir: Sənə filan şeyi verənin xatirinə mənə istədiyimi ver.Onlardan Allah xatirinə istəmişdir. Bir sözlə önəmli bir şeydən ötrü olacağı və insan Allah xatirinə istəyəcəyi zaman haqqı çatırsa ona istədiyi veriləcək. Lakin haqqı çatmayacağı zaman Allah xatirinə istəyərsə belə verilməyəcək.Əgər biri: Allah xatirinə mənə zəkat malından verin!- deyərsə lakin zəkat əhlindən olmazsa ona zəkatdan verilməyəcək.Çünki o, zəkat malını alan sinifə düşmür.Yaxud əgər biri: Allah xatirinə sahib olduğunuz bütün malı mənə verin və özünüzə heç bir şey saxlamayın,-deyərsə ona istədiyi verilməz.

Sual: Əgər kafirlərdən biri: "Lə iləhə illəllah",-deyərsə, insan onun hiyləsi və yalanından qorxduğu zaman onun beli yaxud ayağından vura bilərmi?

Cavab: İnsan tövhidi iqrar etmədiyi sonra isə "lə iləhə illəllah" deyəcəyi zaman onun işinə baxılana qədər rahat buraxılmalıdır.Peyğəmbərin Usaməyə irad tutması buna misaldır. Lakin insan tövhidi dilə gətirəcəyi lakin şirki buraxmayacağı zaman onun sözləri faydasız olacaq.İnsanın şirki buraxması və ondan tövbə etməsi labüddür.Bədəviyə, Hüseynə, Əliyə, Lata yaxud ulduzlara yaxud bütlərə ibadət edənlər "lə iləhə illəllah" deyəcəkləri zaman əməllərindən, şirk və küfrdən tövbə etməyənə qədər onlar rahat buraxılmayacaqlar.Habelə Allahı və Peyğəmbəri (salləllahu aleyhi və səlləm) söyən şəxs bundan tövbə etməyənəcən rahat buraxılmayacaq.

**Sual**: Bir insan, səhabənin başına gələn hadisədə olduğu kimi qorunmaq üçün "lə iləhə illəllah" demək istədiyi zaman onu öldürmək olarmı?

**Cavab**: Xeyir! Onu öncə deməyibsə bunu etmək olmaz. Onun halı araşıdırlmayana qədər bunu etmək olmaz.Hətta əgər insan həmin adamın bunu qorunmaz üçün etdiyini zənn edərsə belə etmək olmaz.

**Sual**: Onu əlinə yaxud ayağına vurmaq olarmı?

**Cavab**: Usamənin (r.a) Peyğəmbərə (salləllahu aleyhi və sələm) dediyi sözlər: "Onu yalnız qorunmaq üçün demişdir. Peyğəmbər (salləllahu aleyhi və sələm) dedi: Onun qəlbinimi yardın?".[42] İnsan onu təməldən deməyib daha sonra onu dilə gətirəcəyi zaman onun işinə baxılana qədər o, rahat buraxılacaq.

**Sual**: Əgər biri, yaxşılığı əmr edən və pislikdən çəkindirən şəxsin artıq işlərlə məşqul olduğunu deyərsə, onun bu sözləri küfr sayılacaqmı?

Cavab: Xeyir küfr sayılmır.Ona bu sözlərin yanlış olduğu və doğru olmadığı bəyan edilməlidir.Əslində onun dediyi şəxs artıq işlərlə məşqul olmur.Bu, cahillikdir.Ona bəyan edilməlidir.

**Sual**: Bəzi müasirlər qeyd etmişlər ki, əgər biri küfr söz deyərsə yaxud küfr əməl edərsə hüccət qaldırılmamış təkfir olunmaz.Daha sonra qəbirə sitayiş edənləri bura daxil etmişlər?

---

[42] Yuxarıda qeyd edilmişdir.

Cavab: Bu, onların cahilliklərindən irəli gəlir.Qəbirə ibadət edənlər kafirdirlər.Yəhudilər və nəsranilər kafirdirlər.Lakin qətlə yetirilmə zamanı tövbəyə çağırılacaqlar.Əgər tövbə etməsələr qətlə yetiriləcəklər.

Sual: Lakin hüccətin qalxması məsələsində onun qaldırılması labüddürmü?

Cavab: Artıq onlara Quran çatmışdır: *“Bu, insanlar üçün bir bildirişdir.”*(İbrahim:52.) O, müsəlmanların arasında ikən Quran onlara çatmışdır: *“Bu Quran mənə vəhy olundu ki, onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim.”*(əl-Ənam:19) *“Ey Elçi! Rəbbindən sənə nazil ediləni təbliğ et!”*.(əl-Maidə:67) Artıq Peyğəmbər Allahın dinini təbliğ etmişdir.Quran isə onların önündədir.Onlar onu radio və digər yerlərdə eşidirlər.Lakin onlar əhəmiyyət vermir və hec vecinə almırlar.Başqa bir adam gəlib onlara pis işləri qadağan etdiyi zaman üzr bəhanəsini gətirirlər.

Sual: Öləcəyi zaman yaxınlarına özünü yandırmağı və külə dönmüş cəsədini toza döndərib dənizə və quruya səpməyi əmr edən kişinin hədisi haqqında nə deyərdiniz?

Cavab: Bu şəxs gizli məsələlərdən olan bəzi şeylərdən, Allahın qüdrətinin kamilliyindən cahil olmuşdur.Bu səbəbdən, Uca Allah onu üzürlü etmişdir.Həmin adamı buna Allahdan qorxması vadar etmişdir.Həmin adam Allahın qüdrətinin kamilliyinə dair cahil olduğu üçün öz yaxınlarına dediyi sözləri demişdir.

Sual: Muazın Peyğəmbərə (salləllahu aleyhi və salləm) səcdə etməsi barədə sizin rəyiniz nədir?

Cavab: Əvvəla hədisin səhihliyi mübahisə doğurur.Lakin əgər o səhih olarsa, deyiləcək ki, Muaz müşriklərin başçılarını gördüyü zaman bunun icazəli olduğunu və Peyğəmbərin (salləllahu aleyhi və salləm) daha fəzilətli olduğunu düşünmüşdür. İslamın ilk çağları olduğu üçün onda bu cür şübhə yaranmışdır.Lakin din tamamilə bərqərar olduğu zaman səcdənin sırf Allaha olduğunu və Allahdan qeyrisinə səcdə etməyin icazəsiz olduğunu bilmişdir.Bu məsələ Muaza qaranlıq qalmış daha sonra bəlli olmuşdur.

Sual: Onların dəlillərindən biri növbəti hədisdir.Peyğəmbər (salləllahu aleyhi və salləm) insanlara əta edəcəyini qeyd etmiş və insanlara xütbə verərək: "Razı qaldınızmı?-dedikdə insanlar: Xeyir!-demişlər."[43] Onlar dedilər: Bu, Peyğəmbəri təkzib etməkdir.Həmin əməl isə küfrdür.Buna dair nə deyə bilərdiz?

Cavab: Xeyir! Onlar Peyğəmbəri təkzib etməmişlər.O, insanlardan soruşur: Razı qaldınızmı? Burada, dəvəni verdiyi şəxsə işarə edir.Ona əlavə verir nəhayət həmin adam razı qalıq.Bu, təkzib etmək deyil.Bu sözləri deyən şəxs cahildir.

Sual: Bəzi insanlara nəsihət olunduğu zaman o deyir: Allah mənə hidayət vermir.Onun hökmü nədir?

Cavab: Ona deyiləcək: Rəbbindən hidayət dilə! Uca Allah buyurur: *"Mənə dua edin, Mən də sizə cavab verim."*(Ğafir:60)

---

[43] Əbu Davud:4534-cü hədis.İbn Macə:2638-ci hədis.Nəsai:4778-ci hədis.Əhməd: 2/232.Şeyx Albani və Şeyx Arnaut bu hədisi səhih saymışlar.

**Sual:** Biz yəqinlik dərəcəsinə çatmışıq və bizə ibadət etmək gərək deyil,-deyən bəzi azmış təriqətlərin imamları barədə nə deyə bilərsiniz?

**Cavab:** Bu, alimlərin icması ilə küfrdür.Kim: Mənim üzərimdən ibadət öhdəçiliyi düşmüşdür,-deyərsə icma ilə kafir olar.Təbii ki, dəli şəxs müstəsnadır.

# Allahdan qeyrisindən yardım istəməyin şirk olmadığına dair qəbirə tapınanların şübhəsinin batilliyi

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Onların digər bir şübhəsi vardır.Həmin şübhə Peyğəmbərin (salləllahu aleyhi və səlləm) bu hədisidir: “Qiyamət günü insanlar Adəmdən, sonra Nuhdan, sonra İbrahimdən, sonra Musadan, sonra İsadan yardım diləyəcəklər.Onlardan hər biri üzrxahlıq edəcək.Nəhayət Peyğəmbərin yanına gələcəklər.” Onlar dedilər: Bu, Allahdan qeyrisindən yardım diləməyin şirk olmadığını göstərir.

Cavab olaraq deyəcəm: Düşmənlərinin qəlblərinə möhür vuran Allah Pakdır, Müqəddəsdir! Biz qadir olduğu bir işdə insandan yardım istəməyi inkar etmirik.Belə ki, Uca Allah Musanın əhvalatında buyurur: *“Tərəfdarlarından olan kəs onu düşməninə qarşı köməyə çağırdı.”*(əl-Qasas:15) Məsələn insan döyüşdə öz silahdaşlarını yaxud başqa adamları, insanın qadir olduğu işlərdə yardıma çağırır.Biz isə onların, övliyaların qəbirləri yanında yaxud qaib ikən yalnız Allahın qadir olduğu işlərdə onlardan ibadət yardımını inkar etdik.Bu sabit olacağı zaman, onların qiyamət günü peyğəmbərlərdən yar-

dım istəmələri, cənnət əhli qiyamət acısından rahatlığa çıxsınlar deyə Allahın insanları sorğu-suala çəkməsi üçün onlardan Allaha dua etmək tələbini ifadə edəcək. Bu isə həm dünya həm də axirətdə icazəlidir. Belə ki, sən, sözlərini eşidən diri olan saleh bir kişinin yanında əyləşir və ona deyirsən: Mənim üçün Allaha dua et! Peyğəmbərin səhabələri ondan bunu sağ ikən istəyirdilər.Onun ölümündən sonra isə onların Peyğəmbərin qəbiri yanında bunu istəmələri qətiyyən baş verməmişdir.Üstəlik sələf onun qəbiri yanında Allaha dua etməyi qəsd edənə irad tutmuşlar.Onun özünə dua etmək barədə nə demək olar?!"

---

## Şərh:

Müşriklərin bir çox şübhələri vardır.İnsanlarda elmin azlığı, cahilliyin çoxluğu və onların batilə etimad etmələri səbəbilə müşriklər həmin şübhələr vasitəsilə insanları şübhəyə salırlar.İnsan batilə öyrəşəcəyi zaman ondan xilas olması çətinləşəcək.Belə olan halda o, öz əməlinə bəraət qazandıran şübhələr axtaracaq və sanki hörümçəyin torundan yapışacaq. Onlar deyirlər: Nə üçün bizə, ölülərə dua etməyi və onlardan yardım istəməyi irad tutursan? Məgər qiyamət günü Allah yanında şəfaət etsinlər deyə insanlar Adəm, Nuh, İbrahim, Musa və İsadan yardım istəməyəcəklər?! Bu isə insanlardan yardım diləməyin icazəli olduğuna dəlalət edir.Çünki Peyğəmbər (salləllahu aleyhi və səlləm) xəbər vermişdir ki, insanlar

qiyamət günü Adəmdən, Nuhdan, İbrahimdən və Musadan onlara şəfaət etmələri üçün yardım istəyəcəklər.Müəllif (rahiməhullah) deyir: Düşmənlərinin qəlblərinə möhür vuran Allah Pakdır, Müqəddəsdir! Diri şəxsdən kömək istəmək ölüdən kömək istəmək mislində deyil.Habelə mövcud olan şəxsdən kömək istəmək qaib şəxsdən kömək istəmək mislində deyil.Onlar arasında böyük fərq vardır.Möminlər qiyamət günü Adəmdən, Nuhdan və İbrahimdən onların iqtidarında olduqları işlərdə onlardan kömək istəyəcəklər.Onlar, Uca Allah qiyamət acısını yüngülləşdirsin deyə peyğəmbərlərin şəfaətini istəyəcəklər.Bu isə həm dünya həm də axirətdə icazəlidir.Qadir olduğu bir işdə başqa insana deyə bilərsən: Mənə filan adamın yanında şəfaətçi ol! Mənə borc ver! Bu işlərdə heç bir qəbahət yoxdur.Habelə döyüşdə baş verdiyi kimi insan silahdaşlarından yardım və kömək istəyib deyir: Sən filan mövqeyi qoru! Sən müəyyən mövqedə olursan digər insanlar isə başqa mövqedə döyüşürlər.Beləcə insanlar düşmən əleyhinə əlbir olub bir-birinə yardımçı olurlar.

Bu xüsusda Musa ilə bir Qibti arasında baş vermiş əhvalatı göstərmək olar.Uca Allah buyurur: *"Tərəfdarlarından olan kəs onu düşməninə qarşıköməyə çağırdı."*(əl-Qasas:15) Həmin insan İsrailli olan Musadan Qibti olan digər bir adama qarşı kömək istəmiş və Musa onun çağırışına səs vermişdir: *"Musa onu vurub öldürdü".*(Qasas:15) Çünki Musa həmin vaxt həmin yerdə mövcud idi və həmin işi etməyə qadir idi.Əgər sən Zeydə yaxud Amra: Mənə xidmətçinə qarşı yaxud övladına qarşı yardım et və onun şərindən qoru,-desən, yaxud tüfəngə sahib olduğu və ya digər bir silaha sahib olduğu üçün bir

adama: Məni vəhşi heyvandan qoru,-desən, bu işdə heç bir qəbahət olmaz.Həmin insan mövcud və qadir olur.Yaxud (mövcud olmazsa) yazışma vasitəsilə olur.Bir insan qaib olduğu halda digəri ona bir məktub yazıb deyir: Mənə filan şeyi yolla, mənə borc göndər! Yəni bunu yazışma vasitəsilə yaxud telefon vasitəsilə edir.Bu işlərdə heç bir qəbahət yoxdur. Lakin bir insanın ölü üstünə yaxud bütə yaxud ağaca yaxud daşa gəlib ondan yardım istəməsi kimi yaramaz işlər müşriklərin etdiyi şirkdir. Mələklər yaxud cinlər kimi qaib məxluqdan yardım istəmək elçilərin, peyğəmbərlərin və xeyirə çağıranların inkar etdikləri şirkdir.Diri, mövcud və qadir yaxud yazışma vasitəsilə və ya digər bir insanın əlaqə qurması üçün tapşırıq vasitəsilə: Ona filan sözləri söylə!-deməklə yaxud hal-hazırda telefon kimi məşhur olan alətlər vasitəsilə qaib şəxsdən yardım istəmək qəbahətsizdir.Əslində sonuncu qaib deyil.O, mövcud insan danışdığı kimi telefonla danışır yaxud bir məktub yazıb: Mənə borc pul göndər yaxud mənə filan şeyi al!-deyir. Bu ikisi arasında fərq vardır.Lakin insanın ölü üstünə gəlib: Mənə kömək ol yaxud sənə sığınıram yaxud sənə pənah apardım,-deməsi, müşriklərin şirkidir. Yaxud ona səcdə etməsi yaxud qurban kəsməsi yaxud yardım istəməsi yaxud mələklər və cinlər kimi qaib məxluqlardan yardım diləyərək: Ey cinlər filan işi görün! Ey Cəbrayıl, ey İsrafil mənə yardım et!-deməsidir.Onlar isə qaib, müşahidə olunmayan və sözləri eşidilməyən məxluqlardır.

Bu, müşriklərin etdiyi əməl və böyük şirkdir.Bunu ağac və daşla yaxud ulduzlarla etmək isə daha çirkin şirkdir.Uca Allah qorusun və hamını müvəffəq etsin!

## Suallar:

Sual: Əgər bir şəxs digər bir insanın Allah yolunda cihada getdiyini görüb ona: Əgər şəhid olsan Allah yanında mənə şəfaətçi ol!-deyərsə, bunun hökmü nədir?

Cavab: Bu şəxs ölümündən sonra şəfaət edəcək.Bunun yeri, insanların dirilişi və toplaşacaqlarından sonradır.Deyirəm: Diriliş və toplanmadan sonra.Hazırki vaxtda ondan istəyib sağ ikən ona vəsiyyət edir ki, qiyamət günü olacağı zaman ona şəfaət etsin.

Sual: Qardaşlıq duasının qaydası necədir?

Cavab: Bu, hər bir şəxsdən istənilmir, xüsusi insanlardan istənilir.Dua tələb etməklə hər bir şəxsə əziyyət vermək isə doğru deyil.Bunu yalnız yaxın qardaşlarından istəməlisən. Peyğəmbər (salləllahu aleyhi və salləm) hər bir şəxsdən bunu tələb etməzdi. Ancaq rəvayət olunur ki, Ömər (r.a) ümrə etmək istədiyi zaman Peyğəmbər (salləllahu aleyhi və salləm) ona demişdir: "Ey qardaşım, dualarında bizi unutma!". Habelə Mədinədə demişdir: "Ey qardaşım, dualarına bizi şərik elə!".[44]Habelə Peyğəmbər (salləllahu aleyhi və salləm) Ömərə Uveys Qarni adlı şəxsə dair vəsiyyət edib demişdir: O, anasına qarşı çox nəvazişkardır.Sizdən kim onunla qarşılaşarsa ondan özü üçün bağışlanma diləməsini istəsin!".[45]Bunu hər bir şəxs üçün

---

[44] Tirmizi, bəbu əxi əşriknə fi duaikə:3562-ci hədis.Əhməd:1/29.Şeyx Albani bu hədisi zəyif saymışdır.

[45] Muslim, bəbu min fədail uveys əl-qarni:2542.

demədi.Bəzi insanlar hər dəfə bir adama rast gəldiyi zaman: Mənə dua et!-deyirlər.İnsanın bunu yalnız bəzən etməsi və qardaşlarına narahatlıq gətirməməsi gərəkdir.

Sual: Uca Allah Kitabında müşrikləri vəsf edərək onların mütəşabihə və şübhələrə uyduqlarını xəbər vermişdir.Bir çox alimlər isə insanın şübhəsi aradan qalxmayana qədər təkfir edilməyəcəyini hesab edirlər.Bu məsələnin təfsilatı necədir?

Cavab: Şübhəsi olandan şübhə aradan qaldırılır.Şübhəsi olmayan üçün isə həmd olsun Allaha deyiləcək.

Sual: Qaib şəxsin, diri ikən telefon yaxud vəkalət yaxud yazışma vasitəsilə sözünü çatdırmaqda bir qəbahət varmı?

Cavab: Bu işdə heç bir qəbahət yoxdur.Ölüyə səslənmək isə heç şübhəsiz ki, müşriklərin etdiyi açıq-aydın şirkdir.Lata, Uzzaya, Mənata və onlar mislində olanlara, habelə mələklərə və cinlərə dua etmək müşriklərin şirkidir.Şübhəsi olandan şübhə kənar edilər.Qaiblərə və qaib olan mələklərə dua etmək, habelə ölülərə dua etmək şirkdir.Diri və mövcud olana nida etmək isə müsəlmanların icması ilə qəbahətsiz işdir. Məsələn diri və mövcud olan insana: Mənə şəfaətçi ol, mənim üçün Allaha dua et!-demək.

Sual: Uca Allahın qiyamət günü dirildəcəyi bədənlər dünyada olan bədənlərdirmi?

Cavab: Bəli, həmin bədənlərdir.Lakin bədənlər dəyişikliyə uğrayıb Adəmin yaradılışı mislində altmış dirsək göyə olacaqdır.

Sual: Mötəbər şübhə ilə mötəbər olmayan şübhənin qaydası nədir?

Cavab: Bəzən gizli qalan şeyi bəyan etmək lazım olur. Qaibdən istəməyin qəbahətsiz iş olduğu zənn edilməməlidir.Ona deyiləcək: Qaib iki qismdir: Ondan yazışma yaxud telefon vasitəsilə bir şey istəyəcəyin zaman şirk olmayacaq.Qaib olduğu halda sənin sözünü eşitdiyini və sənə fayda verəcəyini etiqad etdiyin üçün birindən bir şey istəyəcəyin zaman bu, müşriklərin mələklərlə və Allahdan savayı olan digər məbudlar ilə etdikləri böyük şirk olacaq.

Sual: Növbəti sözləri deyənin hökmü nədir: Ölüdən şəfaət istəmək gizli məsələdir və onun yaşadığı cəmiyyət bunu edir. Yəni, demək istəyir ki, bəyan etmək labüddür?

Cavab: "Adəm oğlu öldüyü zaman onun əməli kəsilir". İnsan öləcəyi zaman onun əməli sona çatır. *"Əgər siz onları çağırsanız, onlar sizin duanızı eşitməzlər, eşitsələr də cavab verə bilməzlər."* (Fatir:14) Ölmüş və dünyadan kəsilmişdir.Artıq onun bundan sonra heç bir əməli olmayacaq.Onların etdikləri əməl isə, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) savaşdığı müşriklərin şirkidir.

Sual: Şübhəyə düşən şəxsin şəhadəti yenidən dilə gətirməsi gərəkdirmi yoxsa tövbə etməsi kifayət edir?

Cavab: Şəhadəti dilə gətirməsə belə etdiyindən tövbə etməlidir.Bəzi elm əhlinin dediyi kimi şəhadəti dilə gətirərsə heç bir qəbahət olmaz.Əsas məqsəd isə yanlış əməlindən qayıtması ilə hasil olan tövbədir.Yəni, insan Allahı buraxıb ölülərə

dua etmək, Allahdan qeyrisinə qurban kəsmək, namazı tərk etmək və orucu danmaq kimi əməllərdən tövbə edəcəyi zaman.İnsan, onu kafirə çevirən şeyi iqrar etməklə İslama daxil olur.Lakin bəzi elm əhlinin dediyi kimi əlavə olaraq şəhadəti dilə gətirəcəyi zaman heç bir qəbahət olmayacaq.Lakin doğru olan, insanın dandığı yaxud nəticəsində kafir olduğu şeyi iqrar etməklə İslama daxil olmasıdır.Məsələn, insan namazın vacibliyini inkar edəcəyi zaman deyəcəyik: İnsan Allaha tövbə edib onun vacibliyini iqrar edəcəyi zaman İslama daxil olacaq.Zinanın haram olduğunu inkar edən üçün deyəcəyik: Tövbə edib zinanın haram olduğunu iqrar edəcəyi zaman İslama daxil olacaq.Hətta şəhadəti yenidən dilə gətirməsə belə İslama daxil olacaq.Çünki şəhadəti dilə gətirmək onu inkar edən şəxsə vacib olur.Habelə qəbirlərə tapınanlar Allaha tövbə edib məhz Allahın ibadətə layiq olduğunu və ölülərə dua etməyin və onlardan yardım istəməyin yasaq olduğunu etiraf edəcəkləri zaman İslama girəcəklər.

**Sual: Məsələlərin gizli və aydın olması zaman və məkan müxtəlifliyi etibarı ilə dəyişirmi?**

**Cavab:** Bəli, dəyişir.Cahillik böyüdükcə gizlilik artır.İslamın qəribliyi daha qabarıq göründükcə gizlilik artır.Lakin insan müsəlmanların arasında olacağı və Quran və sunnəni eşidəcəyi zaman artıq din ona çatmış olacaq.*"Bu, insanlar üçün bir bildirişdir."*(İbrahim:52) Habelə Uca Allah buyurur: *"Bu Quran mənə vəhy olundu ki, onunla sizi və onun çatacağı hər kəsi xəbərdar edim."*(əl-Ənam:19) Artıq həmin şəxsə Quran çatmışdır.

Əgər sən ona: Uca Allaha tövbə et, filan şeyi et!-desən, ola bilsin ki, səninlə mübahisə aparsın və səndən faydalı olanı qəbul etməsin.Hal-hazırda qəbirə tapınanlarla tövhidə dair qarşılıqlı anlaşmaya gəlmək çox çətindir.Bunu yalnız sərt şəkildə etmək mümkündür.Onlar heç kəsin onlarla anlaşmaya gəlməsinə razı deyillər.Onlar özlərinin haqq üzərə olduqlarını hesab edirlər.

Sual: Bu, yalnız tövhid məsələsinə aiddir yoxsa insanı kafirə çevirməyən digər məsələlərə həmçinin?

Cavab: İnsanı kafirə çevirməyən məsələlər, yüngül işlərdir. Məqsəd, insanı kafirə çevirən işlərdir.

Müdaxilə: Cəhmiyyə firqəsinə dair hökm onların avam insanlarını həmçinin şamil edir yoxsa bu məsələdə təfsilat vardır?

Cavab: Əgər onlar, yəhudi və nəsrani avamları mislində başbilənlərinin etiqad etdiyi şeyləri etiqad edirlərsə onlarla birgə olacaqlar.Gizli qalan məsələlər yalnız qüdrətin kamilliyi haqqında bilgi mislində olan məsələlərdir.Buna misal olaraq, yandırılıb külə dönmüş halda küləkli gündə havaya sovrulacağı zaman xilas olacağını düşünərək özünü yandırmağı əmr edən şəxsi göstərmək olar.Uca Allah quruya və dənizə, qalıqları toplamağı əmr edib demişdir: Bunu etməyə səni nə vadar etdi? Həmin şəxs dedi: Ey Rəbbim, Səndən qorxmağım! Uca Allah isə onu bağışladı.

Sual: İndiyənəcən dəvət çatmayan şəxslərin hökmü nədir?

Cavab: Belələri nə müsəlman nə də ki, kafir deyillər və onların işi Allaha aiddir.Onlar fətra əhlidirlər (peyğəmbərlərin dəvətindən kənar qalanlar).

Sual: Müsəlmanların arasında olub Quran dinləyən şəxsin qiyamət günü imtanah olunacağı təsəvvür edilə bilərmi?

Şeyx: Qiyamət günü imtahan olunacaq dediyin zaman nəyi qəsd edirsən?

Sual verən: Yəni, fətra əhlindən olması etibarı ilə imtahan olunacaqmı?

Cavab: Əgər birinə İslam dini çatmayıbsa imtahan olunacaq. Əgər İslam çatıbsa imtahan olunmayacaq.

Sual: Lakin əgər həmin insan müsəlmanlar arasında olarsa necə?

Cavab: Əgər birinə İslam dini çatıbsa həmin adam imtahan olunmayacaq.Artıq Quran və sunnə vasitəsilə beləsinin üzərindən hüccət qalxmışdır.Onun işi isə Allaha aiddir.

Sual: Günümüzdə dəvət çatmadan ölən şəxslər varmı?

Cavab: Bəli, Afrikanın bəzi cənkərlikləri və digər yerlərdə mövcuddur.

Sual: Bununla Peyğəmbərin (salləllahu aleyhi və səlləm) növbəti sözləri arasında necə cəm etmək mümkündür: "Günəş doğduğu və batdığı sürəcə izzətlinin izzəti yaxud zəlilin zilləti ilə İslam hər bir qapını döyəcəkdir."[46]?

---

[46] Əhməd:4/103.Şueyb Arnaut demişdir:İsnadı səhihdir.

**Cavab: Bu hədisin s**əhihliyi araşdırılmalıdır.Onun sə**hihliyi** araşdırılmasa **belə həmin hədis dəvət çatmayana qədər bütün fərdlərə gərəkli deyil.** *"Biz peyğəm**bər göndərm**əmiş ə**zab verm**ə**rik."*** **(əl-**İsra:15)

**Sual: Qəbir**ə tapınanlara birbaşa irad tutmalıyıqmı yoxsa **"zərərin dəf edilməsi mənafeyin cəlb edilməsindən öndədir"** qaydasını tə**tbiq etməliyik?**

**Sual:** Onlardan savadlı olanlara nə**sihət edilməlidir.Onlar tövbə edəcəkləri zaman Allah onlara hidayət verəcək.** Əgər **imtina etsələr, onlar kafirdirlər.**

## Qəbirlərə tapınanların növbəti batil əsaslandırması

Şeyxul-İslam Muhamməd bin Abdul-Vahhəb (rahiməhullah) demişdir:

“Onların digər bir şübhəsi vardır.Belə ki, İbrahimin əhvalatında o, oda atıldığı zaman Cəbrayıl havada onun önündə peydə olub ona: Sənin bir istəyin varmı?-demişdir. İbrahim demişdir: Səndən heç bir istəyim yoxdur.Onlar dedilər: Əgər yardım istəmək şirk olsaydı onu İbrahimə ərz etməzdi.

Cavab: Bu, birinci növdən olan şübhədir.Belə ki, Cəbrayıl ona qadir olduğu bir işdə fayda verməyi ərz etmişir. Uca Allah onun haqqında buyurur: *“Çox qüvvətli olan”.*(ən-Nəcm:5) Əgər Allah onun İbrahimin odunu və onun ətrafında olan ərazi və dağları alıb şərqə yaxud qərbə atmasına izn versəydi bunu edərdi.Habelə əgər İbrahimi onlardan uzaq olan bir yerə qoymasını əmr etsəydi bunu edərdi yaxud onu göyə qaldırmağı əmr etsəydi bunu edərdi.Bu, çoxlu mal-dövləti olan zəngin insan mislindədir. Həmin adam digər bir ehtiyaclı adamı görür və ona, ehtiyacını ödəmək üçün borc vermək yaxud hər hansı bir şeyi hədiyyə vermək təklifini verir. Həmin ehtiyaclı şəxs isə onu götürməkdən imtina edir və Allahdan ona minnətsiz bir ruzinin gələcəyinə qədər səbir

edir.Bu hara, ibadət olaraq yardım istəmək və şirk hara?! Kaş ki, anlayardılar.

İnşallah sözümüzü, öncə qeyd ediləndən anlayacağımız çox əzəmətli və önəmli bir məsələ ilə bitirək. Onun şəninin böyük olması və onda çoxlu yanlışlığın yer alması səbəbilə ona dair ayrıca söz açıb deyirik: Tövhidin qəlb, dil və əməl ilə olmasının labüdlüyünə və bunlardan biri pozulacağı zaman insanın müsəlman olmayacağına dair fikirayrılığı yoxdur. İnsan tövhidi bilib ona əməl etməzsə, firon, iblis və onların mislində olanların küfrü kimi kafir və inadkar olar.Bir çox insanlar bu məsələdə yanlışlıq edib deyirlər:Bu, doğrudur və biz bunu anlayır və bunun haqq olduğuna şahidlik edirik. Lakin biz bunu etmək iqtidarında deyilik və bizim ölkədə yalnız oranın camaatına müvafiq gələn işlər etmək olar yaxud digər üzrlər.Həmin zavallı hələ də bilmir ki, küfr imamlarının əksəriyyəti haqqı bilmiş və onu yalnız müəyyən üzrlər gətirərək tərk etmişlər.Uca Allah buyurur: *"Onlar Allahın ayələrini ucuz qiymətə satmışlar."*(ət-Təubə:9) Habelə buyurur: *"Onu öz oğullarını tanıdıqları kimi tanıyırlar."*(əl-Bəqərə:146) Ancaq əgər insan tövhidi anlamadığı və onu qəlbən etiqad etmədiyi halda ona zahirdə əməl edərsə münafiq olar.Beləsi xalis kafirdən daha şərlidir. *"Həqiqətən, münafiqlər odun ən aşağı təbəqəsində olacaqlar."*(ən-Nisə:145)

İnsanların dilində olan həmin məsələ barədə düşünəcəyin zaman bunun böyük və geniş məsələ olduğu sənə bəlli olacaq.Görəcəksən ki, insanlardan elələri vardır ki, dünyanın yaxud nüfuzun azalmasından qorxaraq yaxud hər hansı bir

şəxsə xoş gəlmək üçün haqqı bilib ona əməl etməyi tərk edirlər.Habelə görəcəksən ki, ona daxildə deyil yalnız zahirdə əməl edir.Beləsindən, onun qəlbən nəyi etiqad etdiyini soruşacağın zaman onun bilmədiyi aşkar olacaq.Lakin sənə Uca Allahın Kitabında gələn iki ayəni anlamaq gərəkdir.

**Birinci:** Uca Allah buyurur: *(Əbəs yerə) üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz."*(ət-Təubə:66) Peyğəmbərlə (salləllahu aleyhi və səlləm) birgə rumlulara qarşı yürüşə çıxan bəzi səhabələrin zarafat və əyləncə olaraq dedikləri bir kəlmə səbəbilə kafir olduqlarına əmin olacağın zaman sənə bəlli olacaq ki, mal-dövlətin yaxud ad-sanın azalmasından qorxaraq yaxud hər hansı bir şəxsə xoş gəlmək istəyərək küfr sözü dilə gətirən və ona əməl edən şəxs onu zarafatca deyən şəxsdən daha acınacaqlı haldadır.İkinci ayə isə, Uca Allahın növbəti ayələridir.(Nəhl:106-107) Uca Allah onlardan yalnız qəlbi imanla sabit olmaqla birgə məcbur ediləni istisna etmişdir. Bundan qeyrisi isə, istər qorxaraq yaxud kiməsə xoş gələrək yaxud vətəninə, yaxınlarına, qəbiləsinə və malına bağlı olaraq yaxud zarafat olaraq yaxud digər məqsədlərdən ötrü edərək küfr edərsə iman gətirdikdən sonra kafir olar. Müstəsna yalnız məcbur ediləndir.

**Ayə buna iki yöndən dəlalət edir:**

**Birinci:** Uca Allah buyurur: *"Məcbur edilən kimsə istisna olmaqla".*(Nəhl:106) Uca Allah yalnız məcbur ediləni istisna etmişdir.Məlum olduğu kimi insan yalnız sözə yaxud felə məcbur edilə bilər. Lakin heç bir kəsi qəlb etiqadına məcbur etmək mümkün deyil.

İkinci: Uca Allah buyurur: *“Bu ona görədir ki, onlar dünyanı axirətdən üstün tutarlar.”*(ən-Nəhl:107) Uca Allah, bu küfrə və əzaba səbəbin etiqad, cahillik, dinə nifrət və küfrə sevgi olmadığını bildirmişdir.Buna səbəb, yalnız dünya mənfəətlərindən hər hansı bir şeyi əldə etmək arzusu və nəticədə dünyanı dindən üstün tutmaqdır.

Uca Allah daha yaxşı Biləndir, İzzətlidir və Kərəm sahibidir.Allahın salavatı və salamı Muhamməddin və onun ailəsinin üzərinə olsun.”

## <u>Şərh</u>:

Müəllif (rahiməhullah) deyir: Müşriklərin, öncə cavabı verilmiş şübhədən savayı digər bir şübhəsi vardır.Belə ki, onlar deyirlər: Tarixdə gəlmişdir ki, İbrahim oda atıldığı zaman onun önündə Cəbrayıl peydə olub demişdir: Sənin bir istəyin varmı? İbrahim dedi: “Səndən heç bir istəyim yoxdur. Allahdan isə vardır.” Onlar dedilər: Cəbrayılın bunu İbrahimə (aleyhi-s-saləm) ərz etməsi Allahdan qeyrisindən kömək və yardım istəməyin icazəli olduğuna dəlalət edir.Çünki bunu Cəbrayıl ərz etmişdir.Əgər bu yasaq osaydı Cəbrayıl bunu etməzdi. Bunlara deyiləcək: Bu, ən böyük cahillikdir. Cəbrayıl, Uca Allahın böyük qüvvət verdiyi əzəmətli bir mələkdir.O, İbrahimə onu xilas etmək və qadir olduğu bir kömək etmək təklifini ərz etmişdir.İbrahim cavab verib ondan heç bir şey istəmədiyini və istəyinin yalnız Uca Allaha olduğunu demişdir.Əgər Uca Allah Cəbrayıla əmr etsəydi ki, İbrahimi səma cəhətinə yaxud uzaq bir yerə aparsın yaxud

alovu söndürsun, Cəbrayıl buna qadir olardı.O, qüvvətli və etibarlıdır. *”Həqiqətən, bu, möhtərəm Elçimizin sözüdür.O, elçi ki, qüvvətlidir, ərşin sahibi yanında böyük hörmət sahibidir, orada itaət ediləndir, etibarlıdır.”*(ət-Təkvir:19-21) O, Cəbrayıldır. Uca Allah onun haqqında digər yerdə buyurur: *“Bunu ona çox qüvvətli olan öyrətdi.Gözəl görünüşlü”.*(ən-Nəcm:5-6) Bu, kasıb bir insana çoxlu mal-dövləti təklif etmək mislindədir.Ona deyir: Ehtiyacın varsa sənə filan şey verim.Pal-paltar, pul-para yaxud təam istəyirsənmi? Kasıb adam isə deyir: Mən səndən heç bir şey istəmirəm.Mən istəyimi başqa yerlərdən tələb edirəm.Bu işdə qəbahət varmı? Bu işdə heç bir qəbahət yoxdur. Qurani Kərim şirki bəyan etmiş və onun, bir insan ölülərə yaxud ağaclara yaxud daşlara yaxud ulduzlara yaxud bütlərə və qeyrisinə gəlib ondan yardım istəməsi və ona nəzr etməsi olduğunu qeyd etmişdir.Hissiyət amilinə bağlı olan səbəblər olmadan ölüdən yaxud bütdən yaxud daşdan yaxud cindən yaxud qaib şəxsdən mədəd və yardım istəyir.Qurani Şərif məhz bunun şirk olduğunu və möminin ondan çəkinməli olduğunu bəyan etmişdir.Bu səbəbdən, Uca Allah buyurur: *“Allahdan başqa heç kəsi çağırmayın.”*(əl-Cinn:18) *“(Allah) gecəni gündüzə, gündüzü də gecəyə qatar. O, günəşi və ayı da ram etmişdir. Onların hər biri müəyyən müddətədək dövr edər. Bu sizin Rəbbiniz olan Allahdır, hökm Onundur. Sizin Ondan qeyri ibadət etdikləriniz bir çəyirdək qabığına belə sahib deyillər. Əgər siz onları çağırsanız, onlar sizin çağırışınızı eşitməzlər; eşitsələr də cavab verə bilməzlər. Özləri də qiyamət günü sizin şirkinizi danacaqlar.Heç kəs sənə hər şeydən xəbərdar olan (Allah) kimi xəbər verə bilməz!”*(Fatir:13-14) Uca Allah müşriklərin bütlər və digər batil məbudlarla etdikləri işdən çəkindirmiş və xəbər vermişdir ki, onların bütləri və batil məbudları heç bir şeyə sahib deyillər və mülk yalnız kainatı idarə edən Allaha məxsusdur.

Ardından sözlərini çox əzəmətli bir sonluqla bitirmişdir. O isə, tövhidin qəlb, dil və əməl ilə olmasının labüdlüyüdür. İnsanın Allaha və yalnız Onun ibadətə layiq olduğuna iman etməsi, habelə bunu dilə gətirməsi, buna əməl etməsi və ibadəti Allaha məxsus etməsi gərəkdir.Əgər insan Allaha şərik qoşub: Mən tövhidin haqq olduğuna, ibadətə layiq olanın Allah olduğuna iman edirəm lakin öz camaatıma müxalif olmaq istəmirəm.Onların etmədiyini etməyəcəm çünki onlara müxalif olmaq istəmirəm.Mən onlarla birgə qəbirlərə və bütlərə ibadət edirəm və onlarla birgə Allahdan qeyrisinə qurban kəsirəm.Lakin mən bilirəm ki, bu, batildir lakin camaatıma xoş gəlmək və onlara müxalif olmamaq üçün edirəm,-deyərsə, bilsin ki, bu, Qureyş kafirlərinin və haqqı bilən digər kafirlərin əməlidir.Uca Allah buyurur: *"Biz bilirik ki, onların dedikləri səni kədərləndirir.Əslində onlar səni yalançı hesab etmirlər. Lakin zalımlar Allahın ayələrini inadla inkar edirlər."* (əl-Ənam:33) Habelə kafir olmuş İsrail oğulları haqqında buyurur: *"Buna qəti inandıqları halda, haqsızcasına və təşəxxüslə onları inkar etdilər."*(ən-Nəml:14) Habelə firon haqqında buyurur: *"Musa dedi: Sən artıq bilirsən ki, bunları yalnız göylərin və yerin Rəbbi, açıq-aşkar möcüzə olaraq endirdi."* (əl-İsra:102) Lakin danma və təkəbbürlük buna mane olmuşdur.

Habelə əgər biri Allahın haqq olduğunu, Peyğəmbərin (salləllahu aleyhi və səlləm) haqq olduğunu və qiyamət saatının haqq olduğunu etiqad edərsə lakin bəzi insanlara xoş gəlmək üçün: Ölülərə dua etmək yasaq deyil, ölülərdən yardım istəmək yasaq deyil,-deyərsə bununla müşrik olar.Həmin şəxs onun əksini etiqad etdiyi halda xalqına xoş gəlmək üçün

bunu edir.Çünki həmin şəxs bunun şirk olduğunu bildiyi halda Allahın haram etdiyini halallaşdırır yaxud onu əməldə edir.O, deyir: Mən bunu etiqad etmirəm lakin xalqıma xoş gəlmək üçün əməldə edirəm.Həmin şəxs Allahdan qeyrisinə səcdə edir, dua edir və Allaha şərik qoşur. Yaxud bir insan dili ilə tövhidi deyir lakin qəlbi ilə onu danır.Həmin şəxs münafiqlər kimi kafir olur.Uca Allah buyurur: *“Onlar qəlblərində olmayanı ağızları ilə deyirlər.”*(Ali İmran:167) Habelə onlar haqqında buyurur: *(Əbəs yerə) üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz.”*(ət-Təubə:66) Habelə əgər onlar: Bizim qəlblərimiz təmiz və sağlamdır,-desələr də, madam ki, onlar şirki və küfrü vacib edən əməllər edirlər kafir olacaqlar.

Bir sözlə qəlb, dil və əməl ilə tövhidin olması labüddür. Əgər insan iddia etdiyi kimi qəlbi ilə Allahı təkləşdirər lakin sözdə yaxud əməldə Allaha şərik qoşarsa bu, ona heç bir fayda verməz.Yaxud qəlbi və dili ilə Allahı təkləşdirər lakin Allahdan qeyrisinə səcdə etmək və ya qurban kəsmək kimi əməldə şirk edərsə, həmçinin bu, ona heç bir fayda verməz. Habelə feli və qəlbi ilə Allahı təkləşdirər lakin sözdə Allaha şərik qoşub Allahdan qeyrisinə dua edərsə, ondan yardım diləyərsə eynilə ona heç bir fayda verməz.Bütün bunlar bir şeydir.Bu üzdən, tövhidin qəlb, dil və əməl ilə olması labüddür.Uca Allah hamını müvəffəq etsin və qorusun!

## Suallar:

Sual: İbrahimin Cəbrayıl ilə ahvalatı səhihdirmi?

Cavab: Buna dair hədislər bilmirəm.Bunu sadəcə tarixçilər qeyd etmişlər.Orada gəlmişdir ki, Cəbrayıl onun yanına havada gəlib demişdir: Sənin bir istəyin varmı? Daha sonra demişdir: Hasbunə-l-lahu va ni`məl vakil.(Allah bizə kifayət edər.O, necə də, gözəl havadardır!).

Sual: İslam ölkələrində qəbirlərə ibadət edənləri görən alimlər onların Allahdan qeyrisinə təvəssül etdiklərinə susurlar.Onlar Allaha istehza edənlərdən daha pis durumda deyillərmi?

Cavab: Bunun təfsilatı vardır.Əgər onlar bunu caiz görürlərsə kafir olurlar.Ancaq əgər səhlənkarlıqdan dolayı münkəri inkar etmirlərsə, lakin özləri həmin münkəri etmir və onu etiqad etmirlərsə bu, yaxşılığı əmr etmək və pisliyi qadağan etmək məsələsinə onların etinasız yanaşmasıdır.Lakin əgər bu, Məkkədə müşriklərdən qorxaraq münkəri inkar etmək iqtidarında olmayanlar kimi qorxu səbəbilə tərk edilərsə, həmin insanlar üzürlü olacaqlar.

Sual: Qəbirlərə ibadət edən və cinlərdən yardım istəyən şəxslərin açıq-aydın şirk əməlləri vardır.Məsələn, insan bunların yanına gəldiyi zaman ilk olaraq onları “lə iləhə illəllah” kəlməsinə, yəni tövhidə dəvət etməlidir yoxsa tədricən onlara yol tapmalı nəhayət müəyyən müddətdən sonra onlara tövhidi anlatmalıdır?

Cavab: Onları tövhidə çağırmaqla başlamalıdır.Çünki yalnız tövhid olduğu zaman əməllər fayda verir.

**Sual:** Bəzi insanlar deyirlər: Sən bunu etməklə insanları qaçırırsan.Bu barədə nə deyə bilərsiniz?

Cavab: Bu, onların cahilliyindən irəli gəlir.Peyğəmbər (salləllahu aleyhi və səlləm) namazla, zəkatla, sədəqələrlə deyil tövhidlə başlamışdır.O, dəvətə başladığı zaman demişdir: “Lə iləhə illəllah” deyin!

**Sual:** Alimə şirk işlərində yaxşılığı əmr etməni və pisliyi qadağan etməni tərk etməyi icazəli edən məcburiyyətin çərçivəsi nədir?

Cavab: Yaxşılığı əmr etmək və pisliyi qadağan etmək tərk olunmur.

**Sual:** Alimlər İslam ölkələrində olan bu adamlar haqqında deyirlər: Onlar, Məkkədə şirk işlərdən çəkindirməyi tərk edən insanlara qiyas olunurlar.

Cavab: Vacib olan, insanlara nəsihət etmək, onlara xatırladıb haqqa bələdçilik etməkdir.İnsan küfr işlərdə istər qəlb ilə, istər fel ilə istərsə də, söz ilə onlara müştərək olmamalıdır. Pisliyi çəkindirmək məsələsində etinasızlıq etmək günahdır. Münkəri inkar etmək vacibdir.Lakin onlar bunu etiqad etməyəcəkləri, onlarla birgə onu etməyəcəkləri və onlara xoş gəlməyə çalışmayacaqları zaman bununla kafir olmayacaqlar. Ancaq əgər onlara xoş gəlməyə çalışıb onlarla birgə münkəri edər və onlarla birgə qəbirə ibadət edərsə, onlarla birgə dinləri söyərsə daha sonra: Bunu onlara xoş gəlmək üçün edirəm,-deyərsə, onun etdiyi şirk olacaq. Ancaq əgər biri onlara xoş gəlməyə çalışmaz və onların batil işlərində onlara

müştərək olmazsa lakin zəif olub onların şərindən qorxaraq yaxud onların rəğbətini qazanmaq məqsədini güdərək onlara aşkar surətdə inkar etmək gücündə olmazsa belə halda bu, mübahisəli mövzu olacaq.

Sual: Şirkə razılığı ifadə edən məcburiyyətin çərçivəsi nədir?

Cavab: İnsanın şirk sözü dilə gətirməsi üçün zorakılığa məruz qalması yaxud ölüm ilə təhdid olunması məcburiyyət adlanır.*"Qəlbi imanla sabit olduğu halda (küfr etməyə) məcbur edilən kimsə istisna olmaqla, hər kəs iman gətirdikdən sonra küfr etsə (onu bəla gözləyir)."*(ən-Nəhl:106) Məsələn, bir insana deyilir: Bunu söylə, əks halda səni öldürəcəyik.Yaxud sözü dilə gətirənəcən qamçılanır.İnsanın qəlbi imanla sabit olacağı zaman bunu dilə gətirməsi məcburiyyət sayılır.İnsan Allaha və məhz Onun ibadətə layiq olduğuna iman etdiyi halda zorakılığı və ölümü dəf etmək üçün onu dilə gətirməsi məcburiyyət sayılır.Çünki Uca Allah şərt qoyub demişdir: *"Qəlbi imanla sabit olduğu halda"*.(ən-Nəhl:106) Ancaq insan qəlbən onlara müvafiq olacağı, habelə qəlbi imanla sabit olmadığı halda onların istəyini yerinə yetirəcəyi zaman kafir olacaq.

Sual: Bəzi müasir alimlər deyirlər: İnsan küfr söz deyərkən yaxud küfr əməl edərkən yalnız onu qəlbi ilə qəsd edəcəyi zaman kafir olacaq.Bu haqda nə deyə bilərsiniz?

Cavab: Bu, xətadır.İnsan qəlbi, dili və əməli ilə kafir olur. Yalnız qəlbi imanla sabit olduğu halda məcbur edilən istisnadır.Zorakılığa məruz qalmaqla yaxud ölümlə təhdid olunmaqla məcbur edilir.Ammar, ibn Məsud və başqa səhabələrin

başına gələnlər buna misaldır.Onlar üzdə müşriklərə müvafiq olmuş lakin qəlbləri imanla, Allahı təkləşdirməklə sabit olmuşdur.

Sual: Həmin alimlər onların şənliklərində iştirak edir və onların başçılarına xeyir-dua verirlər.

Cavab: Əgər onlarla birgə şirk etsələr, onlar müşrikdirlər. Əgər onların şənlikləri şirk işlərdən ibarət olarsa və həmin şəxslər onlarla birgə həmin işlərdə iştirak edərlərsə, onlar müşrikdirlər.Lakin əgər həmin şənliklər yemək və içməkdən ibarətdirsə həmin adamlar müşrik olmurlar.Habelə orada Allahı və Peyğəmbəri söymək kimi murdar əməllər olacağı, həmin adamlarda onlarla birgə orada iştirak edəcəkləri yaxud bu şənliklərdə Allaha küfr, ölülərə dua etmək və onlardan yardım diləmək iqrar olunacağı, həmin insanlar isə bunun qəbahətsiz olduğunu hesab edəcəkləri zaman küfrdə onlara şərik olacaqlar.Allah qorusun!

Sual: Bəzən insanlar onların əməllərini onlara bildirmək və həmin əməllər haqqında söz açmaq imkanı əldə etmək üçün onlarla birgə orada iştirak edirlər.

Cavab: Bu, onların üzərində olan vacibdir.İnsan münkəri inkar etmək üçün orada olacağı zaman əcr qazanacaq. Buna misal olaraq, Peyğəmbərin (salləllahu aleyhi və salləm) həcc mərasimində iştirak edib onlara müraciət etməsini göstərmək olar. Habelə Minada onların yanına gəlib deyirdi: Ey qövmüm! Allahdan qorxun və Bir olan Allaha ibadət edin!

Sual: Dinlər birliyi adlı konfranslarda iştirak etməyin və ona çağırmağın hökmü nədir?

Cavab: Bu konfranslarda iştirak etmək və ona çağırmaq olmaz.

Sual: Kafirlərin etdiklərini inkar etmək gücündə olduğu halda buna susan alimin hökmü nədir?

Cavab: Bu, günah sayılır.Bunu edən isə özünə zülm edir. Ancaq həmin insan yalnız sözü yaxud feli yaxud etiqadı ilə onlara müvafiq gələcəyi zaman kafir olur.Bu üçündən birində olur.Alim, ona vacib olan münkəri inkar etmək işinə susacağı zaman bu susqunluğa görə günahkar olacaq.Çünki o, etmək gücündə olduğu halda bunu etmir.Bəzən deyə bilər ki, o, qorxur. Lakin insanın münkəri inkar etməsi labüddür. Çünki Uca Allah buyurur: *"Mömin kişilərlə mömin qadınlar bir-birinin dostlarıdır.Onlar insanlara yaxşı işlər görməyi buyurur, pis əməllərə qadağa qoyurlar."*(ət-Təubə:71) Habelə buyurur: *"Siz insanlar arasında üzə çıxarılmış ən xeyirli ümmətsiniz.Siz yaxşı işlər görməyi əmr edir, pis əməlləri qadağan edirsiniz."*(Ali İmran:110)

Sual: Məgər onların susmağı küfrə razılıq deyil?

Cavab: Xeyir! Küfrə razılıq deyil.Bu, gərəkli deyil.

Sual: İnsan buna necə razı olur?

Cavab: İnsan küfrdə onlara ortaq olacağı zaman onlar kimi kafir olacaq.Qəbirlərə sitayiş edənlərlə birgə ölülərə dua edəcəyi və onlardan yardım istəyəcəyi zaman onlar mislində

olacaq.Lakin bunu inkar etmək gücündə olmayacağı zaman kafir olmayacaq.

Sual: Əgər biri: İnsan yalnız sözü yaxud feli ilə İslamdan çıxmağı qəsd edəcəyi zaman kafir olur,-deyərsə, onun hökmü nədir?

Cavab: Bu, cahildir.Ona öyrətmək lazımdır ki, küfr bəzən qəlb ilə yaxud dil ilə yaxud əməl ilə olur.Belə ki, "biz bu qarilərimiz kimi qarın doyduran şəxslər görmədik"[47],-deyən şəxslər sözlə kafir olmuşlar.

Sual: Növbəti sözlər murciəliyin əsası sayılırmı: Küfr yalnız qəlb ilə olur?

Cavab: Cumhur fəqihlərə görə küfr qəlb, dil və əməl ilə olur.

Sual: Bunu deyən şəxs murciə olurmu?

Cavab: Murciələr fərqlidir.Onlar deyirlər ki, iman qəlb və dil ilə olur.Onlar deyirlər: Əməllər iman adlanmır.Namaz vacibdir, zəkat vacibdir.Lakin iman adlanmır.Bu, onların yanlış sözüdür.

Sual: Bu, iman və təkfirdə yanlışlıq sayılırmı?

Cavab: Bu məsələyə baxmaq gərəkdir.Təkfir edən şəxsin sözünə baxmaq lazımdır.Murciələr isə əməli imana daxil etməyən firqədir.

Sual: Uca Allaha yaxınlaşdıran əməl olması etiqadı ilə Həramın pəncərələri və qapılarına sürtünməyin hökmü nədir?

---

[47] İbn Cərir ət-Təbəri, təfsiru surati-t-təubə:10/172.

Cavab: Bu, bidətdir.Ondan bərəkət umacağı zaman isə şirk olacaq.Lakin bunun yaxınlıq yaxud itaət olduğunu zənn edərsə bidət olacaq.

Sual: Onun etdiyini inkar etmək lazımdırmı?

Cavab: Bunun bidət olduğunu izah etmək lazımdır.

Sual: İnsan Allahdan qeyrisinə səcdə etməyə məcbur edilərsə, onun bunu etməsi icazəlidirmi yoxsa məcburiyyət sırf sözə aiddir?

Cavab: Xeyir! Hətta səcdə etmək kimi fel olarsa.İnsan qəlbində Allahdan qeyrisinə səcdə etməyin yasaq olduğunu etiqad etdiyi halda səcdə edərsə məcbur sayılacaq.Çünki bu əməl, məcburiyyətdən xilas olmaq növündən bir işdir.İnsan zorakılığa məruz qalarsa və onu öldürməyə qadir olan şəxs tərəfindən təhdid olunarsa, Uca Allaha səcdə etmək niyyəti ilə səcdə edərsə, onun etdiyi məcburiyyət sayılacaq. Doğrusunu bilən Uca Allahdır.

Allahın salavatı və salamı Muhammədin, onun ailəsinin və səhabələrinin üzərinə olsun.

# Mündəricat